Azərbaycan Respublikasının Prezidenti yanında
Elmin İnkişafı Fondunun qrant layihəsi çərçivəsində
nəşr olunmuşdur

**Vasif Qafarov**
**Qiyas Şükürov**

# AZƏRBAYCAN CÜMHURİYYƏTİ TARİXİ

## 1918-1920-ci illər

## (OSMANLI ARXİV SƏNƏDLƏRİ ƏSASINDA)

**BAKI – ELMİN İNKİŞAFI FONDU – 2017**

*Elmi redaktoru:*
**Yaqub Mahmudov**
*AMEA-nın həqiqi üzvü, Əməkdar elm xadimi*

***Rəyçi:***
**Yunus Özger**
*Prof. Dr.*
*Türkiyə Cümhuriyyəti Bozok Universiteti*

**Qafarov V.V., Şükürov Q.E. Azərbaycan Cümhuriyyəti tarixi. 1918-1920-ci illər. (Osmanlı arxiv sənədləri əsasında).** – Bakı: Elmin İnkişafı Fondu, 2017. – 520 səh.

Kitab Azərbaycan tarixinin olduqca mürəkkəb, ziddiyyətli və eyni zamanda maraqlı bir dövrünü əhatə edir. 1918-1920-ci illər Azərbaycan Cümhuriyyəti tarixi ilə bağlı Türkiyə Cümhuriyyəti Başbakanlıq Osmanlı Arxivində mühafizə olunan çoxsaylı sənəd və materiallar bu kitabda elmi dövriyyəyə gətirilmişdir. Transkripsiya edilmiş Osmanlı arxiv sənədlərinə geniş şərhlər yazılmış və həmin sənədlərə istinadən Cümhuriyyət tarixi problemləri araşdırılaraq işiqlandırılmışdır. Zəngin ilkin arxiv sənədləri əsasında 1918-1920-ci illər Azərbaycan Cümhuriyyəti dövrünün obyektiv tarixi mənzərəsi yaradılmışdır.

Kitab Azərbaycan Cümhuriyyəti, eyni zamanda beynəlxalq münasibətlər tarixi ilə məşğul olan mütəxəssislər, bu sahələrdə tədqiqat aparan tarixçilər və yaxın keçmişimizin tarixi ilə maraqlanan oxucu dairəsi üçün nəzərdə tutulmuşdur.

**Bu kitab Azərbaycan Respublikasının Prezidenti yanında**
**Elmin İnkişafı Fondunun qrant layihəsi çərçivəsində çap olunmuşdur:**
**Qrant № EİF/GAM-1-2011-2(4)-26/26/5**

**Bu əsər 15 fevral 2012-ci il tarixində Azərbaycan Respublikasının Prezidenti yanında**
**Elmin İnkişafı Fondu tərəfindən Azərbaycan Respublikası Müəllif Hüquqları Agentliyində**
**qeydiyyatdan keçirilmiş və əsərin qeydiyyatı haqqında 7091 nömrəli Şəhadətnamə**
**(qeydiyyat nömrəsi: 04/C-6018-12) verilmişdir.**

**ISBN: 978-9952-516-08-1**

# عقدنامه

بویوک روسیه انقلابینک جریاننده دولت وجودینک آیری آیری حصه‌لره آیریلماسی ایله زاقافقازیانک روس اوردولری طرفندن ترکی موجب بر وضعیت سیاسیه حاصل اولدی. کندی قوای مخصوصه‌لرینه ترک اولونان زاقافقاسیا ملتلری، مقدراتلرینک اداره‌سنی بالذات کندی اللرینه آلارق زاقافقاسیا قوشما خلق جمهوریتنی تأسیس ایتدیلر. وقایع سیاسیه‌نک انکشاف ایتمه‌سی اوزرینه گورجی ملتی زاقافقاسیا قوشما خلق جمهوریتی جزئندن چیقوب ده مستقل گورجی خلق جمهوریتی تأسیسنی صلاح گوردی.

روسیه ایله عثمانلی امپراطورلغی آراسنده ظهور ایدن محاربه‌نک تسویه‌سی یوزندن حاصل اولان وضعیت حاضره سیاسیه و مملکت داخلنده بولونان مثلسز آنارشی جنوب شرقی زاقافقاسیادن عبارت بولونان آذربایجانه دخی بولوندیغی خارجی و داخلی مشکلاتدن چیقمق ایچون خصوصی بر دولت تشکیلاتی قورمق لزومنی تعیین ایدیبور.

بوکا بناً آراء عمومیه ایله انتخاب اولونان آذربایجان شورای ملیه اسلامیه‌سی بوتون جماعته اعلان ایدیبور که:

۱ــ بوکوندن اعتباراً آذربایجان خلقی حاکمیت حقنه مالک اولدیغی کبی جنوب شرقی زاقافقاسیادن عبارت اولان آذربایجان دخی کامل الحقوق مستقل بر دولتدر.

۲ــ مستقل آذربایجان دولتنک شکل اداره‌سی خلق جمهوریتی اولارق تقرر ایدیبور.

۳ــ آذربایجان خلق جمهوریتی بوتون ملتلر و بالخاصه همجوار اولدیغی ملت و دولتلرله مناسبات حسنه تأسیسنه عزم ایدر.

۴ــ آذربایجان خلق جمهوریتی ملت، مذهب، صنف، سلک و جنس فرقی گوزتمه‌دن قلمروینده یاشایان بوتون وطنداشلرینه حقوق سیاسیه و وطنیه تأمین ایلر.

۵ــ آذربایجان خلق جمهوریتی اراضیسی داخلنده یاشایان بالجمله ملتلره سربستانه انکشافلری ایچون گنیش میدان براقیر.

۶ــ مجلس مؤسسان طوپلانجه‌یه قدر آذربایجان اداره‌سنک باشنده آراء عمومیه ایله انتخاب اولونمش شورای ملی و شورای ملی‌یه قارشی مسئول حکومت موقته دورور.

۲۸ مایس ۱۹۱۸ نجی ییلده

تفلیس شهرنده

آذربایجان ملی شوراسی رئیس معاونی: حسن آغا

کاتب:

فتحعلی خان خویسکی

شفیع بک رستم بکوف

جواد بک ملیک یگانوف

# MÜNDƏRİCAT

**ÖN SÖZ** ........ 7

**GİRİŞ** ........ 11

**ABBREVİATURA** ........ 15

**I FƏSİL. MÜSTƏQİL AZƏRBAYCAN İDEYASININ FORMALAŞMA DÖVRÜ**

1.1. Birinci dünya müharibəsi illərində “Müstəqil Azərbaycan” ideyası və Osmanlı-Azərbaycan münasibətləri ........ 16
1.2. Brest-Litovsk sülh konfransında Qafqaz müsəlmanlarının müstəqilliyi məsələsi ........ 43
1.3. Azərbaycanda xaotik vəziyyət və Nağı Şeyxzamanlının İstanbul səfəri ........ 56
1.4. Trabzon konfransı və Azərbaycan ........ 70

**II FƏSİL. BATUM KONFRANSI VƏ MÜSTƏQİL AZƏRBAYCANIN TƏŞKİLİ**

2.1. Azərbaycanda ilhaq zehniyyətinin təşəkkülü və ilhaqnamələr ........ 101
2.2. Batum konfransı və Azərbaycan ........ 131
2.3. Osmanlı imperatorluğu ilə Azərbaycan Cümhuriyyəti arasında imzalanan Batum müqavilələri ........ 164
2.4. Cənubi Qafqazda ərazi-sərhəd problemləri ........ 179
2.5. Müstəqil Azərbaycanın doğurduğu əks-səda və beynəlxalq aləmdə tanınma problemi ........ 205

**III FƏSİL. OSMANLI-AZƏRBAYCAN SİYASİ, HƏRBİ VƏ İQTİSADİ ƏMƏKDAŞLIĞI**

3.1. Osmanlı-Azərbaycan münasibətlərinin xarakteri ........ 233
3.2. Qafqaz İslam Ordusunun Azərbaycan əməliyyatı və beynəlxalq münasibətlərdə “Bakı məsələsi” ........ 254
3.3. Osmanlı-Azərbaycan hərbi müqavilə layihələri ........ 290
3.4. Osmanlı-Azərbaycan iqtisadi və mədəni əməkdaşlığı ........ 295

**IV FƏSİL. MUDROS ATƏŞKƏS MÜQAVİLƏSİ VƏ AZƏRBAYCANIN TALEYİ**

4.1. Mudros müqaviləsi və Osmanlı qoşunlarının Azərbaycandan təxliyə edilməsi ........ 316
4.2. Əli Mərdan Topçubaşovun İstanbul səfəri və Paris konfransına hazırlıq ........ 336
4.3. Qafqaz respublikaları arasında münasibətlər və Osmanlı dövlətinin siyasəti ........ 346
4.4. Ermənilərin müsəlmanlara qarşı törətdiyi soyqırım cinayətləri ........ 375
4.5. Azərbaycan Cümhuriyyətinin süqutu və mühacir Azərbaycan siyasətçiləri ........ 410

# AZƏRBAYCAN XALQ CÜMHURİYYƏTİ TARİXİNİN ARAŞDIRILMASI İŞİNƏ MÜHÜM TÖHFƏ

## *VASİF QAFAROV VƏ QİYAS ŞÜKÜROVUN "AZƏRBAYCAN CÜMHURİYYƏTİ TARİXİ. 1918-1920-ci illər. (OSMANLI ARXİV SƏNƏDLƏRİ ƏSASINDA)" ƏSƏRİNƏ*

## *ÖN SÖZ*

Azərbaycan xalqının uzun illərdən bəri Rusiyaya qarşı apardığı milli azadlıq mübarizəsi özünün məntiqi yekunu kimi 1918-ci il mayın 28-də türk-müsəlman dünyasında ilk demokratik, hüquqi və dünyəvi dövlət nümunəsi olan Azərbaycan Xalq Cümhuriyyətinin yaranması ilə nəticələndi. Birinci dünya müharibəsinin gedişində "xalqlar həbsxanası" olan Rusiya imperiyasının dağılması ilə əlaqədar olaraq dünyada və regionda gedən siyasi və hərbi proseslər Azərbaycana onu diktə edirdi ki, ya öz müstəqilliyini elan edib mövcudluğunu qorumaq uğrunda mübarizə aparmalı, ya da yenidən müstəmləkə əsarətinə düşməli idi. Belə çətin və mürəkkəb bir zamanda Azərbaycan xalqı yetişdirdiyi aydınların ətrafında sıx birləşərək istiqlaliyyətini elan edib ölkənin suverenliyini qorumaq uğrunda gərgin, yorulmaz mübarizəyə başlamaqla tarixin sınağından üzü ağ çıxa bildi.

Birinci dünya müharibəsinin son mərhələsində Azərbaycana, xüsusilə də neft Bakısına sahib olmaq uğrunda həm qruplaşmalararası, həm də qruplaşmalardaxili mübarizə özünün pik nöqtəsinə qalxmışdı. Vuruşan ölkələrin hər biri Bakı neftinə müharibənin gedişatına təsir edəcək əsas faktorlardan biri kimi baxır və neft şəhərinə yiyələnmək uğrunda kompromissiz mübarizə aparırdı. Əsas mübarizə isə Türkiyə, Rusiya, Almaniya və İngiltərə arasında gedirdi və Bakı neftinin sahibi olan Azərbaycan xalqının mənafeləri nəzərə alınmırdı. Belə ağır şərtlər altında, yeni yaranan və ilk addımlarını atmaqda olan Azərbaycan Xalq Cümhuriyyəti nəinki neft Bakısı və Azərbaycanla bağlı gedən mübarizədən kənarda qaldı, əksinə çox çevik manevr edərək bir çox hallarda bu mübarizənin mərkəzində yer aldı və prosesləri Azərbaycan xalqının mənafelərinə uyğun şəkildə yönəldə bildi. Nəticədə neft Bakısı uğrunda gedən mübarizənin qalibi Azərbaycan Cümhuriyyəti oldu.

Ölkə hüdudlarından kənarda elan olunan Azərbaycan Xalq Cümhuriyyəti hədsiz problemlərlə qarşılaşsa da, bunların hamısına sinə gərib Azərbaycan xalqı qarşısında çox böyük tarixi və şərəfli bir missiyanı yerinə yetirməyi bacardı. Belə ki, Bakı düşmənlərdən

azad edildi, Azərbaycan qəzalarında bolşevik-erməni alyansı tərəfindən türk-müsəlmanlara qarşı həyata keçirilməkdə olan qırğınların qarşısı alındı, Qarabağ, Zəngəzur və Naxçıvanda erməni daşnaklarının antiazərbaycan fəaliyyətləri zərərsizləşdirildi, cənubda yaradılan Muğan Sovet Respublikası ləğv edildi və ölkənin ərazi bütövlüyü və suverenliyi tam bərpa edildi.

Bütün bunlarla paralel olaraq, daxildə də dövlət quruculuğu işləri aparıldı, milli ordu quruldu, Azərbaycan parlamenti yaradıldı, dövlət atributları təsis edildi, vətəndaşlıq, ana dili, təhsil, mədəniyyət və digər sahələrdə qanunlar qəbul edildi, ibtidai və orta məktəblər, universitet açıldı, milli valyuta tədavülə buraxıldı, söz, vicdan, mətbuat, toplaşma azadlıqları təmin edildi və s. Eyni zamanda ölkənin beynəlxalq aləmdə tanınması istiqamətində gərgin işlər aparıldı. Nəticədə 1920-ci ilin yanvarında Azərbaycanın müstəqilliyi Paris Sülh konfransı tərəfindən tanındı. Avropa ölkələrinin Bakıda, eyni zamanda Azərbaycanın da bir çox xarici ölkələrdə diplomatik nümayəndəlikləri təsis edildi.

Fəqət, Azərbaycan xalqının bu xoşbəxtliyi uzun sürmədi. Mövcudluğunun 23-cü ayında Azərbaycan Xalq Cümhuriyyəti Rusiya təcavüzünün qurbanı oldu. 1920-ci il aprelin 27-də Azərbaycan yenidən Rusiya tərəfindən işğal edildi. 23 aylıq mövcudluğu dövründə Azərbaycan Xalq Cümhuriyyəti xalqımızın tarixində və taleyində elə silinməz izlər buraxdı ki, 70 il ərzində Sovet imperiyasının həyata keçirdiyi sərt, amansız tədbirlər, qeyri-insani, ağlasığmaz cinayətlər də müstəqillik fikrini Azərbaycan xalqının yaddaşından silə bilmədi. Eyni zamanda ölkəni işğal edən Rusiya da, beynəlxalq aləmdə tanınan Azərbaycan Xalq Cümhuriyyətinin müstəqilliyi faktını silib ata bilmədi və bu, 1991-ci ildə bərpa edilən Azərbaycan Respublikasının möhkəm özülü oldu.

Hazırda müstəqil dövlət olaraq 27-ci ilini yaşamaqda olan Azərbaycan Respublikası öz sələfi olan Azərbaycan Xalq Cümhuriyyətinin tarixi irsinə sahib çıxıb və onun dərindən araşdırılmasını özünün mühüm vəzifələrindən biri hesab edir. Təsadüfi deyil ki, 1998-ci il yanvarın 30-da Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyev Azərbaycan Xalq Cümhuriyyətinin yaranmasının 80 illiyinin qeyd edilməsi haqqında xüsusi sərəncam verdi. Sərəncamda deyilirdi: "Azərbaycan Xalq Cümhuriyyəti ölkənin daxilində və xaricində yaranmış gərgin və mürəkkəb ictimai-siyasi şəraitdə fəaliyyət göstərmişdir. Bu dövlətin qısa bir müddətdə həyata keçirdiyi tədbirlər xalqımızın tarixində böyük iz buraxmışdır. Milliyyətindən, siyasi və dini mənsubiyyətindən, cinsindən asılı olmayaraq bütün vətəndaşlara bərabər hüquqlar verilməsi, dövlət sərhədlərinin müəyyən olunması, Azərbaycan dövlətçiliyi atributlarının qəbul edilməsi, ana dilinin dövlət dili elan olunması Azərbaycanın gələcək müstəqilliyi üçün möhkəm zəmin yaratmışdır. Demokratik dövlət quruculuğu, iqtisadiyyat, mədəniyyət, təhsil, hərbi quruculuq sahələrində atılmış addımlar Azərbaycan Xalq Cümhuriyyətinin 23 aylıq fəaliyyətini əks etdirən əsas istiqamətlərdir... 1991-ci ildə dövlət müstəqilliyini bərpa edən xalqımız Azərbaycan Xalq Cümhuriyyətinin qısamüddətli fəaliyyətinin zəngin ənənələrindən istifadə etmiş və bu tarixi varislik üzərində müstəqil Azərbaycan dövlətini yaratmışdır." Cümhuriyyətin həyata keçirdiyi tədbirlə-

rin Azərbaycanın gələcək müstəqilliyi üçün möhkəm zəmin yaratdığı xüsusi vurğulanan bu tarixi sənəddə Azərbaycan Xalq Cümhuriyyəti tarixinin tədqiqi də xüsusi olaraq qeyd olunmuşdu.

2008-ci il fevralın 15-də Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev Azərbaycan Xalq Cümhuriyyətinin 90 illik yubileyinin keçirilməsi haqqında verdiyi sərəncamda da Cümhuriyyət dövrünə siyasi qiymət verilir və tariximizin bu mərhələsi ilə bağlı çoxsaylı sənədlərin xarici ölkələrin qapalı arxivlərində saxlanıldığı qeyd edilərək bu sənədlərin tədqiq olunmasının vacibliyi və əhəmiyyəti vurğulanır: "Azərbaycan Xalq Cümhuriyyətinin tarixinə dair sanballı əsərlər, hətta ikicildlik ensiklopediya nəşr edilsə də, tariximizin bu mərhələsi ilə bağlı çox sayda sənədlər hələ xarici ölkələrin qapalı arxivlərində saxlanılır və öz tədqiqatçılarını gözləyir". Prezidentin sərəncamında da qeyd edildiyi kimi, həqiqətən də Azərbaycan Xalq Cümhuriyyətinin tarixi ilə bağlı çoxsaylı arxiv sənəd və materialları xarici ölkələrin, xüsusilə də Türkiyə Cümhuriyyətinin arxivlərində mühafizə olunmaqdadır.

XX əsrin 90-cı illərindən başlayaraq Azərbaycanın 1918-1920-ci illər tarixi ilə bağlı yüzlərlə əsər yazılsa da, bu əsərlərin böyük əksəriyyəti Osmanlı arxiv sənədlərinə istinad edilmədən yazıldığından bəhs edilən əsərlərdə bir çox məsələlər birtərəfli şəkildə araşdırılmış və nəticədə bir sıra yanlışlıqlara yol verilmişdir. Lakin Cümhuriyyət dövrü ilə bağlı Osmanlı arxivlərində tədqiqatlar aparan, geniş, hərtərəfli təhlillər əsasında sanballı əsərlər ortaya qoyan tarixçilərimiz də yox deyildir. Bu mənada AMEA A.Bakıxanov adına Tarix İnstitutunun Azərbaycan Xalq Cümhuriyyəti tarixi şöbəsinin aparıcı elmi işçisi t.ü.f.d. Vasif Qafarovun tədqiqatları xüsusilə diqqətəlayiqdir. Müəllifin 2011-ci ildə nəşr olunan "Türkiyə-Rusiya münasibətlərində Azərbaycan məsələsi (1917-1922)" əsərində Azərbaycan arxivləri ilə yanaşı çoxsaylı Osmanlı arxiv sənəd və materialları da tədqiqata cəlb edilmiş, tədqiq olunan problem tam, dolğun və hərtərəfli araşdırılaraq dövrün obyektiv mənzərəsi yaradılmışdır. Fikrimcə, bu əsər Azərbaycan Xalq Cümhuriyyəti tarixinin araşdırılması işinə ən qiymətli töhfələrdən biridir.

T.ü.f.d. Vasif Qafarov və t.ü.f.d. Qiyas Şükürov tərəfindən Azərbaycan Cümhuriyyəti ilə bağlı Türkiyə Cümhuriyyəti Başbakanlıq Osmanlı Arxivində olan sənəd və materialların araşdırılması və transkripsiya edilərək geniş şərhlərlə birlikdə nəşr edilməsi Cümhuriyyət tariximizin daha dolğun və kompleks şəkildə öyrənilməsinə mühüm töhfədir. Dörd fəsil və on səkkiz paraqrafdan ibarət olan tədqiqat işində Azərbaycan Cümhuriyyəti tarixi ilə bağlı ümumilikdə 376 Osmanlı arxiv sənədi elmi dövriyyəyə daxil edilmişdir. Tədqiqat işində toplanan sənəd və materiallar problemlər üzrə qruplaşdırılmış, hər bir paraqrafda yer alan arxiv sənədlərinə ayrı-ayrılıqda geniş şərh verilmiş və həmin sənədlərə istinadən mövzu araşdırılaraq işıqlandırılmışdır.

T.ü.f.d. Vasif Qafarov və t.ü.f.d. Qiyas Şükürovun "Azərbaycan Cümhuriyyəti tarixi. 1918-1920-ci illər. (Osmanlı arxiv sənədləri əsasında)" adlı tədqiqatının indiyədək Azərbaycanın 1918-1920-ci illər tarixi ilə bağlı yazılan əsərlərdə yer alan yanlışlıqların

aradan qaldırılması, eyni zamanda gələcəkdə bəhs olunan dövrlə bağlı aparılacaq tədqiqatlarda bu kimi yanlışlıqlara yol verilməməsi üçün mühüm əhəmiyyətli bir istinad yeri olacağına, Cümhuriyyət tarixi problemlərinin Azərbaycan və Osmanlı arxiv sənədləri əsasında kompleks şəkildə müqayisəli təhlil metodu ilə araşdırılması üçün geniş imkanlar açacağına və beləliklə tarixçiliyimizdə mühüm bir boşluğu dolduracağına şübhə etmirəm. Müəlliflərə yeni-yeni uğurlu elmi axtarışlar arzulayıram.

***Yaqub Mahmudov***
*AMEA-nın A.A.Bakıxanov adına Tarix İnstitutunun direktoru,*
*AMEA-nın həqiqi üzvü, Əməkdar elm xadimi,*
*Dövlət Mükafatı laureatı*

# GİRİŞ

Zaman etibarilə 1918-1920-ci illər tarix üçün qısa bir dövr olsa da, bu iki il Azərbaycan xalqının tarixində dərin izlər buraxmışdır. Məhz bu dövrdə ölkədə və dünyada baş verən hadisə və proseslərin təsiri altında Azərbaycan xalqının milli istiqlal mübarizəsi "muxtariyyət" uğrunda mübarizədən "milli istiqlal" uğrunda mübarizə mərhələsinə keçdi və bu mübarizə özünün məntiqi yekunu kimi 1918-ci il mayın 28-də itirilmiş dövlətçiliyin yenidən bərpası - Azərbaycan Cümhuriyyətinin yaranması ilə nəticələndi. 1918-ci il mayın 28-də Azərbaycan Milli Şurası "İstiqlal Bəyannaməsi"ni qəbul edib ölkənin müstəqilliyini elan etməklə xalqımız qarşısında çox böyük tarixi və şərəfli bir missiyanı yerinə yetirmiş oldu. Azərbaycan milli azadlıq hərəkatına rəhbərlik edən qüvvələr türk-müsəlman aləmində dünyəvi təməl üzərində qurulan ilk dövləti - Azərbaycan Cümhuriyyətini yaratmaqla nəinki Şərq dünyasına, eləcədə Avropaya nümunə ola biləcək bir dövlət təsisatı qurmağa nail ola bildilər.

XIX əsrin əvvəllərində itirilmiş milli dövlətçiliyin bərpası Azərbaycan xalqının tarixində çox böyük və təqdirəlayiq hadisə idi. Yaranmış tarixi fürsətdən istifadə edib ölkənin müstəqilliyi elan edilməsəydi, Azərbaycan ərazisi Rusiya, Ermənistan və Gürcüstan arasında bölüşdürüləcəkdi. 1918-ci il mayın 28-də yaranan Azərbaycan Cümhuriyyəti çox yaşamadı. Cəmi 23 ay mövcud olan Cümhuriyyət Rusiya təcavüzünün qurbanı oldu. Amma, 1920-ci il aprelin 27-də ölkəni işğal edən Sovet Rusiyası Cümhuriyyətin müstəqilliyi faktını silib ata bilmədi və bu, 1991-ci ildə yenidən bərpa edilən Azərbaycan Respublikasının möhkəm özülü oldu.

Eyni zamanda, bu 23 aylıq mövcudluğu dövründə Azərbaycan Cümhuriyyəti xalqımızın taleyində elə silinməz izlər buraxdı ki, 70 il ərzində Sovet imperiyasının həyata keçirdiyi sərt, amansız tədbirlər, qeyri-insani, ağlasığmaz cinayətlər də müstəqillik fikrini Azərbaycan xalqının yaddaşından silə bilmədi.

Hazırda Azərbaycan müstəqil dövlətdir və dünya birliyinin üzvüdür. Dövlətimiz öz sələfi olan Azərbaycan Cümhuriyyətinin topladığı təcrübəyə böyük əhəmiyyət verir və bu təcrübənin dərindən öyrənilməsini özünün mühüm vəzifələrindən biri hesab edir. 1918-1920-ci illər Azərbaycan Cümhuriyyəti tarixi ilə bağlı Türkiyə Cümhuriyyəti Başbakanlıq Osmanlı Arxivində mühafizə olunan sənəd və materialların araşdırılması və transkripsiya edilərək geniş şərhlərlə elmi dövriyyəyə daxil edilməsi Cümhuriyyət tarixinin daha dolğun və kompleks şəkildə öyrənilməsinə mühüm töhfə olardı.

Azərbaycan Cümhuriyyəti öz mövcudluğu dövründə, xüsusilə də Birinci Dünya müharibəsinin sonunadək olan dövrdə Osmanlı imperiyası ilə sıx ittifaqda olmuş, eyni za-

manda Cümhuriyyətin süqutundan sonra da Azərbaycan siyasi mühacirətinin böyük bir qismi Türkiyəyə pənah gətirmiş və burada fəaliyyət göstərmişdir. Məhz elə bu səbəbdəndir ki, Azərbaycan Cümhuriyyəti tarixi ilə bağlı bir çox sənəd və materiallar Türkiyə arxivlərində toplanmışdır. XX əsrin 90-cı illərinin əvvəllərindən başlayaraq Azərbaycan Cümhuriyyəti tarixinə dair yüzlərlə əsər yazılmışdır. Lakin bir neçə tədqiqat əsəri istisna olmaqla, bu əsərlərin böyük əksəriyyəti Osmanlı arxiv sənədlərinə istinad edilmədən yazıldığından bəhs edilən əsərlərdə bir çox məsələlər, xüsusilə də Osmanlı-Azərbaycan münasibətləri birtərəfli şəkildə araşdırılmış və nəticədə bir sıra yanlışlıqlara yol verilmişdir. 1918-1920-ci illər Azərbaycan tarixi ilə bağlı Osmanlı arxiv sənədlərinin elmi dövriyyəyə daxil edilməsi Azərbaycan Cümhuriyyəti tarixi ilə bağlı aparılan araşdırmalarda yer alan yanlışlıqların aradan qaldırılması, eyni zamanda gələcəkdə bəhs olunan dövrlə bağlı aparılacaq tədqiqatlarda bu kimi yanlışlıqlara yol verilməməsi üçün mühüm əhəmiyyət kəsb edir. Bu sənəd və materiallar 1918-1920-ci illər Azərbaycan tarixi problemlərinin Azərbaycan və Osmanlı arxiv sənədləri əsasında kompleks şəkildə müqayisəli təhlil metodu ilə araşdırılması üçün geniş imkanlar açır və bu, tədqiqatın aktuallığını şərtləndirir.

Tədqiqatın xronoloji çərçivəsi 1918-1920-ci illəri əhatə edir. Lakin Azərbaycan diplomatiyası ölkənin müstəqilliyi hələ elan olunmamış, istiqlal mübarizəsinin gedişində beynəlxalq münasibətlərin subyektinə çevrildiyindən bu mübarizə ilə bağlı sənəd və materialları da tədqiqata cəlb etmək üçün bir çox hallarda xronoloji çərçivədən kanara çıxılmış və bütövlükdə Birinci Dünya müharibəsi dövründə, eyni zamanda Azərbaycan Cümhuriyyətinin süqutundan sonrakı illərdə də Cümhuriyyət ilə bağlı olan sənəd və materiallar dövriyyəyə daxil edilmişdir.

Tədqiqat işində toplanan arxiv sənədləri problemlər üzrə qruplaşdırılmışdır. İş ümumilikdə dörd fəsil və on səkkiz paraqrafa bölünmüşdür. Hər bir paraqrafda yer alan sənədlərə ayrı-ayrılıqda geniş şərh verilmiş və həmin sənədlərə istinadən mövzu araşdırılaraq işıqlandırılmışdır.

Türkiyyə Cümhuriyyəti Başbakanlıq Osmanlı Arxivində mühafizə olunan Azərbaycan Cümhuriyyəti (1918-1920) ilə əlaqədar sənəd və materialların nəşrə hazırlanmasında aşağıdakı transkripsiya və tərtibat qaydalarına riayət edilmişdir:

- Arxiv materiallarının oxunması işində türk tarixçiliyində müntəzəm şəkildə istifadə olunan bəsit transkripsiya qaydaları mənimsənilmişdir;
- Türk dilində olan kəlmələrin transkripsiyasında mümkün dərəcədə dövrün yazı və tələffüz qaydaları mühafizə edilmişdir. Bu səbəblə müasir türk dilində tez-tez təsadüf olunan b/p, d/t, c/ç dəyişikliyinə riayət edilməmiş və bu qəbildən kəlmələr sənədlərin yazıldığı dövrün imla şəkli (məs. olub, Ahmed, Mehmed, oldukca və s.) ilə transkripsiya edilmişdir;

- Ərəb və fars dillərində olan kəlmələrdəki uzun tələffüz edilən hecalar uzatma işarəli saitlər (â, û, î) ilə (məs. vârid, mahsûs, teşkîl və s.) göstərilmişdir;
- Eyn hərfi (‘) işarəsi və həmzə hərfi isə (’) işarəsi ilə verilmişdir. Lakin bu hərflərin transkripsiyasında istisna hallar mövcudur. Belə ki, eyn və həmzə hərfləri ilə başlayan sözlərdə, xüsusi isimlərdə mümkün dərəcədə qeyd olunan transkripsiya qaydalarına riayyət edilməmişdir. Bu transkripsiya üsulu sadəcə bəhs olunan hərflərin sözün ortasında (məs. ma‘rifet, te’mîn və s.) və sonunda (məs. vukû‘, memnû‘ və s.) gəldiyi hallarda tətbiq edilmişdir;
- Ərəbcə kəlmələrdəki "əl" (əlif+lam) liqaturu xüsusi isim və ünvanlar ilə yer adları və ay adlarında bitişik yazılmışdır (məs. Şeyhülislâm, Abdurrahmân, Zilhicce və s.). Bunun xaricindəki hallarda isə transkripsiya qaydalarına riayyət edilmişdir;
- Xüsusi isimlər (ölkə adları, yer adları, şəxs adları, ünvanlar və ləqəblər və s.) böyük hərflə yazılmışdır;
- Tərtibata daxil edilən bütün arxiv materialları, hər şeydən əvvəl, mövzulara görə təsnif edilərək, xronoloji ardıcıllığa riayət üsulu ilə nömrələndirilmişdir;
- Nömrələndirilmiş mövzuya daxil olan hər bir arxiv sənədinin ən son qismində fond adı və mühafizə edildiyi qovluq kodları, vərəq və səhifələri qeyd edilmişdir;
- Bütün arxiv sənədləri Başbakanlıq Osmanlı Arxivinə aid olduğundan təkrarçılığa yol verməmək üçün sənədlərin sonunda və iqtibaslarda arxivin adı (BOA) verilməmiş, birbaşa fond adı, dosya, gömlək və vərəq nömrələri qeyd edilmişdir;
- Xüsusi isimləri tamamlamaq, hadisələrin cərəyan etdiyi illəri miladi tarix ilə eyniləşdirmək üçün guşəli mötərizə işarəsindən [ ] istifadə edilmişdir;
- Sənədlərin əslində mövcud olan əlavələr və izahlar mötərizə işarəsi ( ) ilə verilmişdir;
- Arxiv sənədlərinin əsillərindəki boşluqlar və yaxud da yazılmayan kəlmələr, dekodlaşdırılmayan şifrəli kəlmələr, çürük və yaxud da silinmiş sənədlərdəki oxunaqsız kəlmələr mötərizə işarəsi daxilindəki üç nöqtəli boşluqlar (…) ilə verilmişdir;
- Səhifə altında olan türk dilindəki şərhlər mətnin əslindəki izahatlardır. Azərbaycan dilindəki şərhləri isə müəlliflər mətnə əlavə etmişlər.

Tədqiqatın metodoloji əsasını obyektivlik, tarixi hadisələrə kompleks yanaşma və sistemlilik prinsipləri təşkil edir. Müəlliflər mənbələri öyrənərkən, həmçinin, tarixi alternativlik prinsipinə əsaslanmış, müqayisəli-tənqidi təhlilin aparılmasına üstünlük vermişlər. İş problemlər üzrə xronoloji ardıcıllıqla yazılmışdır. Tarixi hadisə və proseslərə yanaşmada rəğbət və ya nifrət deyil, tarixi fakt və hadisələrə obyektiv, ədalətli münasibət

göstərilmişdir. Müəlliflər tədqiqat işi üzərində işləyərkən təkcə problemin öyrənilməsi və faktik materialların toplanması ilə kifayətlənməmiş, eyni zamanda həmin faktları və sənədləri hərtərəfli və dərindən təhlil etməyə, onların arasındakı əlaqələri və ziddiyyətləri aşkara çıxarmağa, hadisələrin əsl mahiyyətini açmağa çalışmışlar.

Müəlliflər Türkiyə arxivlərində tədqiqatın aparılmasında göstərdiyi köməyə görə Türkiyə Cümhuriyyəti Başbakanlıq Dövlət Arxivləri sabiq Genel Müdür Yardımçısı Prof. Dr. Mustafa Budaka, sənədlərin transkripsiyasını kontrol etmiş Bozok Universiteti Fən-Ədəbiyyat Fakültəsi Tarix Bölümünün professoru Yunus Özgerə, bir sıra Osmanlı arxiv materiallarını təqdim edən Sakarya Universiteti Fən-Ədəbiyyat Fakültəsi Tarix Bölümünün müəllimi Dos. Dr. Mustafa Sarıya, həmçinin, Başbakanlıq Osmanlı Arxivinin əməkdaşları Salih Kahriman, Didem Evren, Nurullah Nehir, Pınar Azap, Uğur Koca və Gülçin Abaya təşəkkür edirlər. Əsərin yazılmasında və nəşrə hazırlanmasında verdiyi dəyərli tövsiyələrə, göstərdiyi diqqət və qayğıya görə müəlliflər, AMEA A.A.Bakıxanov adına Tarix İnstitutunun direktoru akademik Yaqub Mahmudova təşəkkür etməyi özlərinə borc bilirlər.

# ABBREVİATURA

| | |
|---|---|
| A.VRK | : Sadâret Evrâk Kalemi |
| BEO | : Bâb-ı Âlî Evrâk Odası |
| BOA | : Başbakanlık Osmanlı Arşivi |
| DH.EUM | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti |
| DH.EUM, 2.Şb. | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti İkinci Şube |
| DH.EUM.5.Şb. | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti Beşinci Şube |
| DH.EUM.AYŞ | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti Âsâyiş Kalemi |
| DH.EUM.EMN | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti Emniyet Kalemi |
| DH.EUM.KLH | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti Kalem-i Husûsî |
| DH.EUM.LVZ | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti Levâzım Kalemi |
| DH.EUM.SSM | : Dâhiliye Nezâreti Emniyet-i Umûmiye Müdîriyeti Seyr ü Sefer Müdîriyeti |
| DH.HMŞ | : Dâhiliye Nezâreti Hukûk Müşâvirliği |
| DH.İ.UM | : Dâhiliye Nezâreti İdâre-i Umûmiye Müdîriyeti |
| DH.KMS | : Dâhiliye Nezareti Kalem-i Mahsûs Müdîriyeti |
| DH.MKT | : Dâhiliye Nezâreti Mektûbî Kalemi |
| DH.ŞFR | : Dâhiliye Nezâreti Şifre Kalemi |
| HR.HMŞ.İŞO | : Hâriciye Nezâreti Hukûk Müşâvirliği İstişâre Odası |
| HR.İM | : Hâriciye Nezâreti İstanbul Murahhaslığı |
| HR.MTV | : Hâriciye Nezâreti Mütenevvia Kısmı |
| HR.SYS | : Hariciye Nezâreti Siyâsî Kısım |
| İ.DUİT | : İrâde Dosya Usûlü |
| MV | : Meclis-i Vükelâ Mazbataları |
| RSFSR | : Rusiya Sovet Federativ Sosialist Respublikası |
| səh. | : Səhifə |
| v. | : Vərəq |
| XKS | : Xalq Komissarları Soveti |

# I FƏSİL

# MÜSTƏQİL AZƏRBAYCAN İDEYASININ FORMALAŞMA DÖVRÜ

## 1.1. Birinci dünya müharibəsi illərində "Müstəqil Azərbaycan" ideyası və Osmanlı-Azərbaycan münasibətləri

Birinci dünya müharibəsində yanacağa olan ehtiyacın artması və neft mənbələri uğrunda gedən mübarizə Azərbaycanı vuruşan dövlətlərin maraq dairəsinə daxil etdi. Bakı neft mənbələrini ələ keçirmək uğrunda istər bloklararası istərsə də bloklardaxili mübarizə gedirdi. Almaniya Bakı neftinə sahib olmağı Antanta üzərində qələbənin əsas şərtlərindən biri hesab edir, İngiltərə isə buna imkan verməməyə, neft Bakısını öz nəzarətinə keçirməyə çalışırdı. Ölkənin taleyi ilə bağlı olan bu kimi həyati əhəmiyyətli məsələlər Azərbaycan aydınlarını fəal şəkildə siyasi proseslərə cəlb etdi.

Dünya müharibəsinin başlanması bütün dünyada olduğu kimi, Azərbaycanda da milli azadlıq hərəkatına təkan verdi. Məhz bu dövrdə ölkədə və dünyada baş verən hadisə və proseslərin təsiri altında Azərbaycan xalqının milli istiqlal mübarizəsi "mədəni muxtariyyət" uğrunda mübarizədən "milli-ərazi muxtariyyəti", daha sonra "milli istiqlal" uğrunda mübarizə mərhələlərinə keçdi. Azərbaycan xalqı Rusiyaya qarşı apardığı bu mübarizədə Osmanlı dövlətinə arxalanır, ondan kömək umurdu.

Dünya müharibəsinin başlanmasından üç ay sonra müharibəyə girən Osmanlı dövlətinin də Azərbaycan və bütövlükdə Qafqazla bağlı xüsusi planları var idi. Osmanlı dövləti Almaniyadan "müharibənin zəfərlə başa çatacağı təqdirdə Qafqazın Türkiyəyə veriləcəyi" təminatını almışdı.

Müharibəyə girdikdən sonra, Türkiyə xaricindəki iki yüz milyondan artıq müsəlmandan və xüsusilə də Rusiyadakı türk-müsəlman zümrələrindən geniş ölçüdə faydalanmaq məqsədilə Osmanlı dövləti "Cihad" elan etdi və bütün türk-islam aləmini Antanta dövlətlərinə qarşı müharibəyə çağırdı. Qafqazda isə "türkçülük" və "turançılığ"ın əsaslarına söykənən bir siyasətin gerçəkləşdirilməsi planlaşdırılmışdı. Ümumiyyətlə, ittihadçılar Türkiyədə iqtidarı ələ keçirdikdən sonra Yusif Akçura tərəfindən "üç tarz-ı siyasət" kimi irəli sürülmüş "Osmanlılıq", "İslamçılıq" və "Türkçülük" cərəyanlarının hər üçünə söykənən bir siyasət yeritməyə başladılar. Lakin Birinci dünya müharibəsi başladıqdan sonra baş verən ictimai, siyasi və hərbi proseslər nə "Osmanlılığ"ın, nə də "İslamçılığ"ın gerçəkləşməsinin mümkün olmayacağını ortaya çıxardı. Müharibə başladıqdan sonra ərəblərin ingilislərə, ermənilərin ruslara meyl etmələri və bunlarla bağlı baş verən hadisələr "Türkçülüy"ü və "Turançılığ"ı ön plana çıxardı. Osmanlı hakim dairələri bundan sonra

Qafqaz və Orta Asiya ilə daha çox maraqlanmağa başladılar və "Turançılıq" Osmanlı dövlətinin rəsmi siyasətinə çevrildi.

Osmanlı dövləti Rusiyaya qarşı hərbi əməliyyatlara başladıqda türkçülük ideologiyası ölkənin rəsmi siyasətində əsas yer tutmuşdu. Ənvər paşa Rusiyaya qarşı aparılan hərbi əməliyyatların əsas məqsədini Rusiya imperiyası tərkibində olan bütün türk xalqlarının çarizmin əsarətindən azad edilməsi və Böyük Turan dövlətinin tərkibinə daxil edilməsində görürdü.

Osmanlı dövləti Rusiyaya qarşı müharibəyə başladıqdan sonra "İttihad və Tərəqqi" Cəmiyyəti tərəfindən 1914-cü il noyabrın 11-də cəmiyyətin bütün şöbələrinə göndərilən bəyannamədə deyilirdi: "Vətənimizin və millətimizin milli idealları bizi Moskva düşmənini məhv etməyə yönəltməkdədir; beləliklə, Rusiyadakı bütün irqdaşlarımızı içinə alan, onlarla birləşməyimizə imkan verəcək təbii hüdudlarımız əldə edilmiş olacaqdır". Bu idealı gerçəkləşdirmək məqsədilə Ənvər paşa Qafqaz cəbhəsində ilk böyük hərbi əməliyyat olan Sarıqamış əməliyyatına başlamışdı. Qafqaz cəbhəsində türk ordusunun qarşısında aşağıdakı vəzifələr qoyulmuşdu: qalib türk orduları bütün Qafqazı tutmalı, Cənubi Azərbaycana keçməli, Xəzər dənizini bütün tərəflərdən əhatə etməli, sonra Volqa-Ural rayonlarında tatar əhalisini və Orta Asiya müsəlmanlarını Rusiyaya qarşı ayağa qaldırmalı idi. Hərbi nazir Ənvər paşa gənc türklərin liderlərinin müşavirəsində bildirmişdi ki, Almaniyanın köməyi ilə biz təkcə Makedoniyanı deyil, həm də Qafqaz və Misiri tutacaq və İttihad və Tərəqqi partiyasının hakimiyyətini dünyada ən güclü imperiyaya çevirəcəyik.

Osmanlı dövləti Qafqaz müsəlmanlarını Rusiyaya qarşı ayağa qaldırmaq üçün Azərbaycana ordu hissələri göndərməyi də planlaşdırır və rus arxa cəbhəsinə müsəlmanların köməyi ilə zərbə vurmaq istəyirdi. Bu məqsədlə Osmanlı dövləti Qafqaz müsəlmanları ilə təmas yaratmaq üçün yollar axtarırdı. Ancaq Osmanlı dövləti ilə Qafqaz müsəlmanları arasındakı yolda maneə olan iki xalq vardı: gürcülər və ermənilər. Osmanlı dövləti Qafqazla bağlı planlarını reallaşdırmaq məqsədilə gürcü və ermənilərdən də faydalanmaq qərarına gəldi və hər iki xalqın qabaqcıl nümayəndələri ilə danışıqlar aparmağa başladı. Müharibənin əvvəllərində Qafqazın gələcək statusu ilə bağlı aparılan danışıqlarda Osmanlı hakim dairələri erməni və gürcülərə muxtariyyət (sonradan gürcülərə müstəqillik) vəd etsələr də, Azərbaycanın müstəqilliyinə dair heç bir vəd vermir, onun gələcək Turan imperiyasının tərkibinə qatılmasını planlaşdırırdılar.

1914-cü il noyabrın əvvəllərində 3-cü türk ordusu Ərzurum-Sarıqamış istiqamətindən hücuma keçdi və Acarıstanadək irəliləməyə nail oldu. İlk uğurlardan ruhlanan və buna böyük əhəmiyyət verən Ənvər paşa orduya komandanlığı şəxsən öz üzərinə götürdü və böyük hücuma başlamaq əmrini verdi. Ənvər paşanın əsas məqsədi Qars və Sarıqamış arasında rus qoşunlarını məğlub etmək idi. Burada rusların dayaq məntəqəsi yerləşirdi. Bu əməliyyatın uğurla qurtaracağı təqdirdə Cənubi Qafqazın istilası əslində həll edilmiş olurdu.

1914-cü ilin dekabrın 22-dən 1915-ci ilin yanvarın 19-dək davam edən Sarıqamış əməliyyatında yüksək dağlar, yolsuzluq, sərt şaxtalar kimi çox ağır bir şəraitdə türk ordusu göstərdiyi fədakarlıqlara baxmayaraq, rus cəbhəsini yara bilməyib fəlakətlə üzləşdi, 90 min nəfərlik 3-cü ordu 78 min əsgər itirdi.

Qafqaz cəbhəsində türk və rus orduları arasında gərgin döyüşlərin getdiyi bir vaxtda Ənvər paşa əmisi Xəlil bəyin komandanlığı altında Cənubi Azərbaycana və Qafqaza 13 min nəfərdən ibarət bir ordu göndərdi. "Birinci kuvve-i seferiye" adlanan bu ordu Təbrizi tutduqdan sonra Şimali Azərbaycana keçərək Bakını tutmalı, sonra Dağıstana doğru irəliləyib müsəlman əhalisini Rusiyaya qarşı ayağa qaldırmalı, rus ordusuna arxadan zərbə vuraraq onları Xəzər dənizinin qərb sahillərindən geri oturtmalı idi. 1914-cü il dekabrın 11-də Ənvər paşa Xəlil bəyə göndərdiyi teleqramda bu ordunun vəzifəsini detallarına qədər açıqlayırdı: "Vəzifəniz fırkanızla İranda Təbriz üzərindən Dağıstana yürüyərək orada ümumi bir üsyana əsas olmaq, yürüş əsnasında rus dəmir yol və teleqraf xətlərini, xüsusilə Bakı-Tiflis xəttini dağıdıb, rusları Xəzər dənizinin qərbindən geri oturtmaq; yoldakı aşairi ruslar əleyhinə müharibəyə təşfiq və sövq etməkdir".

Xəlil bəyin komandanlığı altında türk ekspedisiya korpusu 1915-ci ilin yanvarında Təbrizi ələ keçirdi. Gənc türklər hərəkatının görkəmli xadimi, İttihad və Tərəqqi partiyasının Azərbaycan və Qafqaz üzrə baş müfəttişi təyin olunmuş Ömər Naci Azərbaycanın şimal və cənub hissələrinin Türkiyənin himayəsi altında birləşdirilməsi ideyasını irəli sürdü və Bakı istiqamətində hərəkət etmək üçün, Cənubi Azərbaycandakı şahsevən tayfaları ilə əlaqə yaradaraq, onlardan silahlı dəstələr formalaşdırmağa başladı. Lakin Ömər Nacinin bu planı baş tutmadı. 1915-ci il yanvarın sonunda rus qoşunları hücuma keçib Təbrizə daxil oldular, Xəlil bəyin ekspedisiyası Təbrizi tərk etmək məcburiyyətində qaldı. Türk qoşunlarının Cənubi Azərbaycandakı bu uğursuzluğu Osmanlı dövlətinin Azərbaycanla bağlı planlarının reallaşmasına imkan vermədi.

1915-ci ilin fevralında Gəncədə fəaliyyət göstərən "Difai" təşkilatının nümayəndəsi Əmiraslan Xan Xoyski (Fətəli Xan Xoyskinin qardaşı oğlu) gizli surətdə cəbhə xəttini keçərək, Ənvər paşanın Ərzurumda olan qərargahına gəlib Osmanlı hərbi komandanlığının nümayəndələri ilə görüşdü. Osmanlı rəsmi dairələri tərəfindən "özünü "Difai" cəmiyyətinin qurucularından olduğunu bəyan edən" Əmiraslan Xan Xoyski haqqında Əhməd bəy Ağaoğludan ətraflı məlumat alındıqdan[1] sonra Ə.X.Xoyski Ənvər paşa tərəfindən qəbul edildi. Danışıqlarda o, Ənvər paşaya Qafqazda bir çox millətlərin daxil olduğu İsveçrə tipli müstəqil bir dövlət qurulmasını təklif etdi. Ə.X.Xoyskinin bu səfərdə əsas məqsədi Bakı, Yelizavetpol, İrəvan quberniyaları ilə Terek və Dağıstanı əhatə edəcək bir dövlətin qurulması işinə Osmanlı dövlətinin razılığını və yardımını almaq idi.

Ənvər paşaya təqdim edilən layihədə Azərbaycanın Osmanlı dövlətinə birləşdirilməsindən deyil, burada müstəqil bir dövlətin yaradılmasından söhbət gedirdi. Bunun müqabilində Ə.X.Xoyski Qafqazda yüz minlərlə müsəlmanın Rusiyaya qarşı döyüşməyə hazır olduğunu bildirib, əgər Osmanlı dövləti Cənubi Azərbaycandan dəstək verərsə, Dağıstan və Cənubi Qafqaz müsəlmanlarını Rusiyaya qarşı üsyana qaldırmağa söz verirdi. Sarıqamışda fəlakətlə üzləşdikdən sonra, artıq təkcə öz qüvvəsi ilə Qafqazın işğalını həyata keçirə bilməyəcəyini anlayan Osmanlı dövləti Qafqaz müsəlmanlarının Rusiyaya qarşı üsyana qaldırılması məqsədilə Ə.X.Xoyskinin irəli sürdüyü layihəni məqbul hesab etdi. Bununla da, Qafqazda Rusiya və Osmanlı dövləti arasında bufer rolunu oynayacaq bir müsəlman dövlətinin qurulması fikri ortaya atılmış oldu. Osmanlı hakim dairələrinin

[1] BOA, DH. EUM. KLH, no. 1/22, v. 1-2; BOA, DH. EUM, 2. Şb., no. 5/41, v. 1-4.

mövqeyinə görə, Türkiyənin himayəsində olacaq bu "İslam dövləti" Osmanlı şahzadəsinin idarəsində olmalı idi.

Osmanlı dövləti Qafqaz müsəlmanlarını Rusiyaya qarşı ayağa qaldırmağa böyük əhəmiyyət verirdi. Bu məqsədlə Xəlil bəyin, Ömər Nacinin və Şoybner-Rixterin ekspedisiyaları təşkil edilsə və Ə.X.Xoyski ilə bu barədə razılığa gəlinsə də, Qafqaz müsəlmanlarını Rusiyaya qarşı ayağa qaldırmaq cəhdləri nəticəsiz qaldı.

Osmanlı dövləti Azərbaycan və bütövlükdə Qafqazla bağlı planlarını reallaşdırmaq üçün diplomatik-siyasi vasitələrdən də istifadə edirdi. Ənvər paşanın təlimatı və yardımı ilə Şimali qafqazlı, azərbaycanlı və gürcülərdən ibarət yaradılmış "Qafqaz Komitəsi" Qafqaz xalqlarının apardığı milli istiqlal mübarizəsini Türkiyənin himayəsi altında birləşdirməyə çalışır və Qafqazda bir neçə muxtar ölkədən ibarət vahid dövlətin yaradılmasını və bu dövlətin idarəsinin Osmanlı şahzadəsinə verilməsini təklif edirdi. Bu ideyanın gerçəkləşməsi üçün Almaniya və Avstriya-Macarıstanın dəstəyinə ehtiyac duyan Osmanlı hakim dairələri Qafqaz Komitəsinin nümayəndələrindən ibarət bir heyəti Vyana və Berlinə göndərdilər. Daha sonra Rusiya məhkumu olan millətlərin, o cümlədən azərbaycanlıların nümayəndələrindən ibarət "Türk-Tatar heyəti" təşkil edilərək Avropaya göndərildi. Bu heyətlərin təşkil edilməsində əsas məqsəd Rusiya müsəlmanlarının hüquqsuz vəziyyətini, çarizmin milli zülm siyasətini Avropaya çatdırmaq və rus imperiyasında yaşayan türk-müsəlman xalqların milli azadlıq mübarizəsinə Avropa dövlətlərinin dəstəyini almaq idi. Lakin bu səfərlər istənilən nəticəni vermədi. Osmanlı dövlətinin müttəfiqləri Qafqaz xalqlarının Rusiyaya qarşı apardıqları mübarizəni dəstəklədiklərini və müstəqil bir Qafqaz dövlətinin yaradılmasının tərəfdarı olduqlarını bildirməklə kifayətləndilər.

Ümumiyyətlə, Osmanlı dövlətinin Birinci Dünya müharibəsinin əvvəllərindən başlayaraq, Qafqaz və xüsusilə Azərbaycanla bağlı yeritdiyi siyasətin araşdırılması onu deməyə əsas verir ki, Ənvər paşa və digər ittihadçıların Qafqaz və İranda apardıqları hərbi əməliyyatların təməlində gənc türklərin yeritdiyi islamçı və türkçü siyasət dururdu. Osmanlı dövlətinin Azərbaycan və bütövlükdə Qafqazla bağlı planlarını reallaşdırmaq üçün türk hərbi komandanlığının göstərdiyi bütün səylərə baxmayaraq, 1914-1916-cı illərdə Qafqaz istiqamətində aparılan hücum əməliyyatları tam uğursuzluqla nəticələndi. Canlı qüvvə itkiləri ilə yanaşı Türkiyə ərazisinin bir hissəsi də rus orduları tərəfindən işğal edildi. 1916-1917-ci illərin qışında türk-rus cəbhəsində kəşfiyyat xarakterli hərəkətlərdən başqa elə bir ciddi hadisə olmadı. Sarıqamış əməliyyatından 1917-ci ilin sonlarına qədər Qafqaz cəbhəsində üstünlük Rusiya tərəfində idi. 1917-ci ilin oktyabrında baş vermiş bolşevik çevrilişindən sonra Rusiya daxilində tüğyan edən anarxiya, bolşeviklərin verdiyi "Sülh dekreti" ilə rus cəbhələrinin faktiki olaraq dağılması və rus dövlətçiliyinin dərin böhrana düşməsi Osmanlı dövlətinin hakim dairələrində "Turançılıq" ideyasının gerçəkləşməsi yolunda yeni ümidlər yaratdı. 1917-ci ilin sonlarına doğru yaranmış əlverişli şəraitdə Azərbaycan və bütövlükdə Qafqazla bağlı planlarını reallaşdırmaq istəyən Osmanlı dövləti Qafqaz bölgəsini özünün fəal xarici siyasət orbitinə daxil etdi.

Birinci dünya müharibəsində bitərəfliyini elan etməsinə baxmayaraq İran, o cümlədən Cənubi Azərbaycan ərazisi də müharibə aparan dövlətlərin mübarizə meydanına çevrilmişdi. Dünyada və regionda baş verən hadisələrin təsiri altında Cənubi Azərbaycanda da demokratik hərəkat başlamış, daha sonra bu hərəkat milli hərəkata çevrilmiş və genişlənmişdi. Cənubi Azərbaycan ərazisində hərbi qüvvəsi olan hər bir ölkə bu hərəkatı öz

maraqlarına uyğun şəkildə yönəltməyə cəhd göstərmiş və bir çox hallarda bu cəhdlər müsbət nəticə vermişdir. 1917-1918-cu illərdə Cənubi Azərbaycanda və İranda cərəyan edən hadisə və proseslər haqqında İrandakı türk diplomatlarının Osmanlı Xarici İşlər Nazirliyinə göndərdikləri raportlarda İranda və xüsusilə də Cənubi Azərbaycanda cərəyan edən hadisə və proseslər haqqında məlumat verilir və qeyd edilir ki, Rusiya inqilabının təsiri ilə Cənubi Azərbaycanda da inqilabi hərəkatın başlayacağı və ölkənin müqəddəratı uğrunda mübarizə aparılacağı gözlənilir. İran hökumətinin Təbriz üsyanının genişlənərək Tehrana yayılmasından qorxduğu xüsusi vurğulanan sənəddə bildirilir ki, azərbaycanlılarda əzm və ciddiyyət görünür, həmçinin Qafqaz müsəlmanları da onlara dəstək verirlər.[1]

Osmanlı dövlətinin Təbriz Şəhbəndərliyindən Əli Hüseyin bəyin Osmanlı Xarici İşlər Nazirliyinə göndərdiyi 26 oktyabr 1918-ci il tarixli "İran Azərbaycanının ümumi əhvalı haqqında" raportunda rus ordusunun çəkilməsindən sonra Cənubi Azərbaycanda cərəyan edən siyasi və hərbi proseslər, Təbrizdə aclıq çəkən əhalinin vəziyyəti və Urmiya, Xoy, Savucbulaq, Miyandoab şəhərlərində rus silahı ilə silahlanmış və təlim görmüş erməni əsgər və zabitlərinin müsəlmanlara qarşı törətdikləri soyqırım cinayətləri haqqında təfsilatlı məlumatlar verilir.[2]

## ARXİV SƏNƏDLƏRİNİN TRANSKRİPSİYASI

### № 1

[9 fevral 1915]
Bâb-ı Âlî
Dâhiliye Nezâreti
Şifre Kalemi
27 Kânûnusânî [1330]
Erzurum'dan Alınan Şifre

Kafkasya'nın Gence şehri ahâlîsinden Emîr Arslan Han, nâm-ı diğer Han Hoyski bir hafta evvel Erzurum'a gelmiş, İran kâr-perdâzına misâfir olarak Almanya Konsolosu ile sıkı temâsda bulunmuşdur. Dün bu adamla görüşdüm. Kafkasya'da Difâî Cemiyeti'nin kuvve-i icrâ'iye re'îsi olduğu, Üçüncü Kolordu'nun Alman kumandanları idâresinde bulunduğunu bilerek, bir fırka ile İran cihetinden Kafkasya'ya geçmek fikriyle geldiğini, İstanbul'da bu mes'ele için kimse ile görüşmediğini, kendisini Ahmed Ağayev ve Trabzon komiserlerinden İsfendiyar Bey'in tanıdıklarını söyledi. Bu adamın ifâdâtı Trabzon tarîkiyle gelmesi, İstanbul'da kimse ile görüşmemesi, Almanlarla doğrudan doğruya temâsı, Hükûmet-i Seniyye himâyesinde Gürcü ve Dağıstan prensliklerinin teşekkülüne çalışacağını söylemesi cây-ı dikkat görüldüğünden harekâtı taht-ı tarassuda alınmışdır. Bu adamın Ağayev ve İsfendiyar Beyler'den ta'yîn-i hüviyyeti müsterhamdır.

27 Kânûnusânî [1]330
Erzurum Vâlîsi
Tahsîn
DH.EUM, 2.Şb., no. 5/41, v. 4.

***** ***** *****

---

[1] BOA, HR.SYS, no. 2340/37, v. 1-2.
[2] BOA, HR.SYS, no. 2341/55, v. 1, s. 1-4.

**№ 2**

[17 fevral 1915]
Emniyet-i Umûmiye
İstıtlâât Müdîriyeti

<table>
<tr><td>Tesvîdi</td><td rowspan="4">Hulâsa<br>Emîr Arslan Han<br>Nâm-ı Diğer Han<br>Hoyski Hakkında</td><td>Kısım</td><td>Sınıf</td><td>Â'idiyyet</td><td>Aded-i Husûsî</td></tr>
<tr><td>4/12/[1]330</td><td colspan="3">Dâ'ire Numarası</td><td>Husûsî</td></tr>
<tr><td>Tebyîzi</td><td colspan="4">Şu'be Numarası</td></tr>
<tr><td>4 minhû</td><td colspan="3">Mukaddem</td><td>Mu'ahhar</td></tr>
</table>

Tercümân-ı Hakîkat Gazetesi Başmuharriri Ağaoğlu Ahmed Bey'e

Kafkasya'da Difâî Cemiyeti Kuvve-i İcrâiye Reîsi olduğunu ve zât-ı âlîlerini tanıdığını ifâde eden ve el-yevm Erzurum'da bulunan Gence şehri ahâlîsinden Emîr Arslan ve yâhûd Han Hoyski ismindeki şahsın hüviyyet ve mesleği, şâyân-ı i'timâd bir adam olub olmadığının serî'an iş'ârına himmet olunması mütemennâdır efendim.

[imza]

DH.EUM.KLH, no. 1/22, v. 1.

***** ***** *****

**№ 3**

[18 fevral 1915]

Efendim Hazretleri,

Dün idâre-hâneye bendenize verilmek üzere irsâl buyurulan mektûba yalnız şimdi dest-res olabildim ve hemân cevâbına mübâderet eyliyorum. Difâî Cemiyeti 1906 senesinde Ermeni-Müslüman kargaşası esnâsında bendeniz tarafından Bakü'de teşkîl olunmuşdu. İki sene devâm etdikden sonra Rus Hükûmeti'nin ta'kîbât-ı şedîdesine binâen bu cem'iyet dağıldı ve bânîler ve rehberleri öteye beriye yayıldılar. Cem'iyetin mevcûd olduğu kana'âtinde değilim. Han Hoyski'ye gelince, Hoyski â'ilesi pek vâsi'dir. Bunlardan Bakü'de da'vâ vekâleti ile meşgûl olan zât benim arkadaşımdı ve mektûb-ı âlînizde kasdü'l-bahs olunan adam bu ise tamâmen i'timâd edebilirsiniz. Fakat Han Hoyski â'ilesine mensûb olanlar arasında Rus tarafdârlığını güdenler de vardır. O gibilerine bi't-tab'i i'timâd olunamaz. Ma'a-mâ-fîh Han Hoyski â'ilesi Gence eyâletinde pek meşhûr olduğundan ve beyne'l-ahâlî sâhib-i nüfûz bulunduğundan bunlardan ihtiyâta ri'âyet etmek şartıyla istifâde şâmildir. Bâkî arz-ı ihtirâmât ve meveddet eylerim.

Ağaoğlu Ahmed

DH.EUM.KLH, no. 1/22, v. 2, səh. 1-2.

***** ***** *****

**№ 4**

[20 fevral 1915]
Bâb-ı Âlî
Dâhiliye Nezâreti
Emniyet-i Umûmiye Müdîriyeti Kalemi
Umûmî
Husûsî
122
Erzurum Vilâyeti'ne
Şifre

C.: 27 Kânûnusânî [1]330: Hoyski â'ilesinin pek vâsi' olduğu ve eğer bildirilen şahıs vaktiyle Bakü'de da'vâ vekâleti etmiş ise kendisine tamâmen i'timâd edilebileceği ve bu â'ileden Rus tarafdârlığı güdenler de bulunursa da kendileri Gence'de pek meşhûr ve beyne'l-ahâlî sâhib-i nüfûz olduklarından ihtiyâta ri'âyet olunmak şartıyla istifâde kâbil olabileceği bi't-tahkîk anlaşılmışdır.

7 Şubat [1]330
Nâzır
[Mehmed Talat Paşa]
Keşîdesi: İsmâîl

DH.ŞFR, no. 50/44.

***** ***** *****

**№ 5**

[13 mart 1915]
Bâb-ı Âlî
Dâhiliye Nezâreti
Şifre Kalemi
Mahreci : Başkale
Emniyet-i Umûmiye Müdîriyet-i Aliyyesi'ne

Genceli Emîr Arslan Han nâmında kumral bıyıklı, mâ'î gözlü, orta boylu bir şahıs buraya gelmişdir. İstanbul'a Kafkas murahhası olarak gitdiğini beyân ediyor. Hakkında hürmet-i mahsûsada bulunulmakdadır. Ancak yedinde bir vesîka görülmediğinden hüviyetinin kendisini tanıdığını ifâde etdiği Ahmed Ağayev Bey'den bi't-tahkîk işʻâr buyurulması.

28 Şubat [1]330
Vâlî Cevdet
DH.EUM, 2.Şb., no. 5/41, v. 2.

***** ***** *****

**№ 6**

[14 mart 1915]
Dâhiliye Nezâreti
Emniyet-i Umûmiye Müdîriyeti
3/675

<table>
<tr><td>Evrâk Umûmî Numarası</td><td>Müsevvidi</td><td>Mübeyyizi</td><td rowspan="4">Müdîriyet'den Şifre</td><td colspan="2">Battâlının Kaleme Vürûdu Târîhi</td></tr>
<tr><td></td><td></td><td>[imza]</td><td colspan="2"></td></tr>
<tr><td>Kalem Numarası</td><td>Târîh-i Tesvîd</td><td>Târîh-i Tebyîz</td><td colspan="2">Mukâbele Edenler</td></tr>
<tr><td>14</td><td>1 Mart sene [1]331</td><td>1 minhû</td><td></td><td></td></tr>
</table>

Van Vâlîsi Cevdet Bey'e

C.: 28 Şubat [1]330 gecesi Emîr Arslan hakkında Erzurum Vâlîsi Tahsîn Bey de îzâhât istemişdi. Ahmed Ağayev bu zâtın Hoyski â'ilesinden olduğunu ve eğer vaktiyle Bakü'de da'vâ vekâleti etmiş ise kendisine tamâmen i'timâd olunabileceğini ve bu Hoyski â'ilesinden Rus tarafdârlığı güdenler bulunursa da kendileri Gence'de pek meşhûr ve beyne'l-ahâlî sâhib-i nüfûz bulunduklarından ihtiyâta ri'âyet olunmak şartıyla istifâde kâbil olduğunu bildirmişdir.

DH.EUM, 2.Şb., no. 5/41, v. 1.

***** ***** *****

**№ 7**

[12 iyun 1917]
Bâb-ı Âlî
Hâriciye Nezâreti
Şifre Kalemi
1180

Fî 12 Haziran sene [1]917 Târîhiyle Musul'da Bulunan Tahran Sefâret-i Seniyyesi Maslahatgüzârlığı'ndan Vârid Olan 30 Numaralı Telgraf-nâmenin Hallidir.

Azerbaycan mücâhidlerinin Rus inkılâbından bi'l-istifâde Azerbaycan'ın istiklâlini i'lân edecekleri inkılâbı müte'âkib haber alındı. Birkaç gün sonra da Tebriz'de bir ihtilâl zuhûr ederek serdâr-ı reşîd ile diğer ba'zı me'mûrîn-i iraniye ihtilâlciler tarafından tevkîf olundu. Tahran Hükûmeti Meclis-i Mebûsân'ı ictimâ'a davet ile Azerbaycan'ın mukadderât ve istikbâli hakkında müsâ'ade-kârâne müzâkerâta başlayacağını va'd ile ihtilâlcileri muvakkatan iskât etdi ise de fırkalar arasındaki ihtilâfât meb'ûsân intihâbının icrâsına mâni' olmakda bulunduğundan intihâbâta başlanamadı. Rus nüfûzundan biraz kurtulmuş olan İran şimdi de İngilizlerin taht-ı te'sîrine girdi. Rus hükûmet-i hâzırası İran efkâr-ı umûmiyesini kazanmak için İran umûr-ı dâhiliyesine müdâhale etmeyeceğini Hükûmet-i İraniye'ye teblîğ etmiş ve evvelki müdâhalâtından kısmen sarf-ı nazar etmiş ise de Şimalî

İran mâzîsi lekeli Rus tarafdârı bir takım ricâl-ı iraniyenin ve Cenûbî İran dahi İngilizlerin taht-ı te'sîrinde bulunduğundan intihâbâtın matlûb vechle icrâsı te'mîn edilemiyor. Hükûmet-i merkeziyenin muhâfaza-ı âsâyiş husûsundaki ikdâmâtına rağmen Tebriz ihtilâlinin başka taraflara sirâyetinden ve ale'l-husûs Tahran'da ihtilâl zuhûrundan korkulmakdadır. Rus hâline nazaran intihâbât icrâ edilemeyecekdir ve Azerbaycan ihtilâli tevessü' ederek umûmî bir şekil alacakdır. Çünkü Azerbaycanlılarda bir azm ü ciddiyet görülmekde ve Kafkas Müslümanları da Azerbaycanlılara müzâheret etmekdedirler. İran'ın netîcesi mechûl ve mübhem olan şu vaz'iyet-i hâzırasının pîş-gâh-ı enzâr-ı devr-i bünyânelerine arzını vecîbeden add eyledim.

HR.SYS, no. 2340/37, v. 1.

***** ***** *****

**№ 8**

[30 iyun-2 iyul 1917]
Bâb-ı Âlî
Hâriciye Nezâreti
Umûr-ı Siyâsiye Müdîriyet-i Umûmiyesi
Mühimme Kalemi
2 Temmuz sene [1]333

<table>
<tr><td>Evveliyât ve Müzeyyelât</td><td></td><td>Kayıd Numarası</td><td>Târîh</td><td>Müsevvid</td><td>Mümeyyiz</td><td>Müdîr-i Umûmî</td><td>Melfûfât</td></tr>
<tr><td>Hulâsa</td><td></td><td>162</td><td>30 Haziran sene [1]333</td><td></td><td></td><td></td><td></td></tr>
<tr><td>Müstenid Olduğu Evrâk</td><td>Tahran Telgrafnâmesi 12 Haziran sene [1]917 30</td><td colspan="6" rowspan="2">Nev'-i Müsvedde:<br>Sadâret-i Uzmâ'ya</td></tr>
<tr><td colspan="2">Umûmî Numara: 98737<br>Husûsî Numara: 221<br>Târîh: 1 Temmuz sene [1]333 / [1]917</td></tr>
</table>

Azerbaycan mücâhidlerinin Rus inkılâbından bi'l-istifâde Azerbaycan'ın istiklâlini i'lân edeceklerinin inkılâbı müte'âkib haber alındığı, birkaç gün sonra da Tebriz'de bir ihtilâl zuhûr ederek serdâr-ı reşîd ile diğer ba'zı me'mûrîn-i iraniyenin ihtilâlciler

Osmâniye'ye merbûtiyet-i mahsûsası bulunan Hâkim Aka-yı Mecidüssaltana'ya bir mikdâr esliha verilmiş ve efrâdı ta'lîm için Osmânlı zâbitleri de ta'yîn olunmuş ise de her işi "leyte ve le'alle" ile geçişdirmeğe alışmış olan İran me'mûrlarından fa'âliyet-i azimkârâne beklemek abesdir. Velî'ahd ba'zı mülâhazât-ı indiye ile mu'allim zâbitânımıza tevdî'-i umûr etmekden tevekkî eylemiş; onlar da kıt'alarına avdet etmişdir.

Ve'l-hâsıl şehrin sükûn ve âsâyişi Osmânlı askerinin vücûduna medyûndur. Tebriz, kolordu karârgâhı iken hiç kimseden bir zerre-i şikâyet işidilmiyordu. Kuvvet azaldıkça, askerin erzâk toplaması, ebniyeyi işgâl eylemeleri, efrâd-ı askeriyemizin ba'zı harekâtı gibi ufak tefek şeyler bahâne edilerek, şikâyet ve i'tirâzlar resmî ve gayr-ı resmî sûretde tevâlî etmeğe başladı. Bunun ne gibi te'sîrât ve teltîfât eseri olduğu ma'rûzât-ı ânife ve âtiye ile ma'lûm olur.

Kısm-ı a'zamı parasız, pulsuz takımından ve eşrârdan olub terör teşkîlâtına da mâlik olan Tebriz Demokratları Azerbaycan-ı İran'ın istiklâli tarafdârıdırlar. Re's-i kârında Seyyid Celîl Erdebilî, Sertîbzâde gibi aklı başında ba'zı kimseler var ise de onlar da harîsî-câh ve servetdirler.

Seyyid Celîl Berlin'de toplanmış olan Alman tarafdârı İran Demokratları'nın ta'lîmâtıyla geçende İstanbul'dan buraya gelmişdir. Bunlar Alman Konsolos Vekîli sıfatıyla hareket eden, vaktiyle Şiraz, ahîren Musul Alman Konsolotları'nı vekâleten idâre eylemiş olan Mösyö Vostrov'dan mâddî ve ma'nevî müzâherete nâ'il olmakdadırlar. Mûmâ-ileyh nezd-i âcizîye gelerek Nevberî ve rufekâsının tahliyesi için teşebbüsde bulunmaklığımı ricâ etdi. Hâlbuki velî'ahd hazretleri bunların Kars'dan i'âdeleri mukarrer ise İran hudûduna muvâsalatlarında i'zâm edeceği me'mûrîne teslîm edilmelerini taleb ve tahte'l-hıfz Tahran'a sevklerini münâsib gördüğünü âcizlerine beyân eyledi. Müşârün-ileyhin arzusuna binâen bu husûsda Dokuzuncu Ordu Kumandanlığı'yla muhâbere etmekdeyim. Tebriz, Almanya Konsolosluğu'na ta'yîn edilmiş olan Mösyö Leiken henüz gelmemişdir.

Reşt'de İngilizlere karşı hareket etmekde iken son zamânlarda terk-i muhâsame eden Mirza Küçük Han'a gönderilmek üzere ahîren buradaki Almanlara gelen ve konsoloshâneye nakl olunan silâhların da el altından bu eşirrâya tevzî' olacağını zann ediyorum.

Mezkûr fırkadan İran'ın bilâ-teczî istiklâli ve memleketin nâ'il-i sükûn ve refâh olması tarafdârı olanlar ayrılarak "Sosyal Demokrat" ve ahîren "İttihâd" nâmlarıyla grublar teşkîl etmişlerdir. Sebât edebilirlerse belki idâme-i âsâyişe muvaffak olurlar. İttihâd Partisi'nin mü'essisi Hükûmet-i Osmâniye'ye merbûtiyet-i mahsûsasını mücâhedâtıyla isbât eden Hâcî Mirza Aka Billûrî'dir. Kendisi Hoy ve Selmas hâkimliğine ta'yîn olunmuşdur. Mûmâ-ileyhin emsâli pek az olması şâyân-ı te'essüfdür.

"İttihâd-ı İslâm" nâmıyla Mirza Alî Aka Heyet isminde münevverü'l-fikr bir zât tarafından teşkîl olunan diğer bir cem'iyet de memleketin refâh ve sa'âdeti ve ma'ârifi ve Hükûmet-i Osmâniye ile İran'ın ve her iki milletin münâsebât-ı vidâdiyelerinin tahkîmi gibi güzel emeller perverde etmekde ise de fa'âl uzvları yok gibidir. İş görmekden ziyâde konuşmak ve çay içmek için toplanıyorlar.

Bi'l-'umûm Azerbaycan'da husûsiyle Tebriz'de açlık, hastalık pek müdhişdir. Her gün sokaklarda, kulübelerde açlıkdan, tifüs ve hümmâ-yı tifüs ve emrâz-ı sâ'ireden yüzlerce kişi telef oluyor. Galâ-yı es'âr kaht derecesindedir. Hubûbât az değil, fakat köy

sâhibi müteneffiz zengînlerin eyâdî-i inhısâr ve ihtikârındadır. Kuvvetli ve teşkîlâtlı bir hükûmet yok ki bu sefâletlerin meh-mâ-emken izâlesine çâre-sâz olsun. Bir fakîr â'ilenin dereye atılmış bir at lâşesiyle tagaddîye çalışdıklarını bi'z-zât gördüm. Hulûl etmekde olan kış da tezyîd-i felâkete bâ'is olacakdır. Azerbaycan'ın şiddet-i bürûdetine karşı mahrûkât az ve bi't-tab'i çok bahâlıdır. A'yân nâmıyla yâd olunan zengînler kendi râhatlarından başka bir şey düşünmüyorlar. Kalblerinde zerre-i merhamet yokdur. Halkın sefâletini temâşâdan zevk alıyorlar denilebilir.

Şehrin idâme-i âsâyişi ve halkın tehvîn-i ihtiyâcâtı emrinde gerek velî'ahd hazretleri ve gerek me'mûrîn-i eyâleti her mülâkâtımda îkâzdan ve taleb eyledikleri müzâhereti îfâdan hâlî kalmadığımı ve ahvâl-ı mahalliye hakkında peyderpey arz-ı ma'lûmât etmekliğim tabî'î olmakla berâber Tahran Maslahatgüzârlığı ile sûret-i husûsiyede te'mîn-i muhâbereye çalışdığımdan oradan alacağım ma'lûmâtı da iş'âra müsâra'at edeceğimi arz eylerim. Emr ü fermân hazret-i men lehü'l-emrindir.

Fî 26 Teşrînievvel sene 1334
Tebriz Başşehbenderliği'ne Me'mûr
Şehbender
Alî Hüseyin

Mürâca'at Odası ma'rifetiyle Evrâk Odası'na vürûdu târîhi: 14 Kânûnusânî sene 1335
Takdîm: Fî 14/[0]1/[13]35
Mühimme'ye: Fî 10 Şubat sene [13]35
Kalem-i Mahsûs'dan mürûr
Hıfz

HR.SYS, 2341/55, v. 1, səh. 1-4.

***** ***** *****

## 1.2. Brest-Litovsk sülh konfransında Qafqaz müsəlmanlarının müstəqilliyi məsələsi

Birinci dünya müharibəsindəki rus-türk hərbi 1917-ci il 2 (15) dekabr Brest-Litovsk və 5 (18) dekabr Ərzincan barışıqları ilə sona çatdı.1917-ci il dekabrın 9-da (22-də) Sovet Rusiyası ilə Almaniya bloku ölkələri arasında Brest-Litovsk sülh konfransı öz işinə başladı və danışıqlara bir neçə dəfə ara verilməklə konfrans 1918-ci il martın 3-nə (fevralın 18-nə) qədər davam etdi. Bu dövrdə Osmanlı dövləti bütün nəzər diqqətini sülh danışıqlarına yönəltmişdi. Osmanlı dövlətinin Brest-Litovsk sülh konfransında reallaşdırmaq istədiyi Qafqazla bağlı istəklərini üç qismə bölmək olar:

1. Rusların işğalı altında olan Şərqi Anadolu vilayətlərinin boşaldılması (geri alınması);

2. 1877-1878-ci illər rus-türk müharibəsinin yekununa görə Osmanlı dövlətinin ödəyə bilmədiyi müharibə təzminatının bir qisminin əvəzi olaraq Rusiyaya vermək

məcburiyyətində qaldığı türk torpaqlarının – Qars, Ərdəhan və Batum vilayətlərinin Osmanlı dövlətinə qaytarılması;

3. Sovet Rusiyasının elan etdiyi "xalqların öz müqəddəratını təyin etmək" hüququndan yararlanıb Qafqaz müsəlmanlarının müstəqilliyinə nail olmaq və Qafqazda Türkiyənin himayəsi altında bir müsəlman dövləti yaratmaq.

Bu arada Osmanlı hökuməti öz mövqeyində qəfil dəyişiklik edib Zaqafqaziya Komissarlığı ilə əlaqələr qurmaq qərarına gəldi. Artıq bu dövrdə Osmanlı dövləti nəyin bahasına olursa olsun Cənubi Qafqaz hökumətinin müstəqilliyini tanımaq və bununla da Rusiyanın Qafqaza hakim olmasının qarşısını almağa çalışırdı. Türkiyə ilə Rusiya arasında Qafqazda bufer rolunu oynayacaq bir dövlətin yaranması Osmanlı dövlətinin planlarına uyğun idi. Amma Osmanlı hakim dairələri bu dövləti erməni və gürcülərin üstünlük təşkil etdikləri Zaqafqaziya Komissarlığının timsalında deyil, Qafqaz müsəlmanlarının bir "İslam dövləti" kimi görmək istəyirdilər. Lakin Şərqi Anadolunun da bir hissəsi ruslar tərəfindən işğal edildiyindən türklər Qafqazdan uzaq düşmüşdülər və bölgədə baş verən hadisələrin gedişinə təsir etmək imkanında deyildilər. Bu səbəbdən Osmanlı dövləti reallıqla barışıb Zaqafqaziya Komissarlığı ilə əlaqə yaratmaq, onun "müstəqilliyi"ni tanımaq qərarına gəldi və 1918-ci il yanvarın 16-da (3-də) Komissarlığı rəsmən Brest-Litovska dəvət etdi. Lakin Zaqafqaziya Komissarlığı yanvarın 23-də (10-da) Vehib paşaya vurduğu teleqramda Brest sülhündə iştirak etməkdən imtina etdiyini və özünün Rusiyanın tərkib hissəsi olduğunu bildirdi.

1918-ci il fevralın 10-da Brest-Litovsk danışıqları növbəti dəfə kəsildi və Sovet nümayəndə heyətinin rəhbəri L.Trotski Petroqrada qayıtdı. Brest-Litovsk danışıqlarından bir nəticə hasil olmadıqda, Ənvər paşa Qafqaz cəbhəsindəki 3-cü ordu komandanı Vehib paşaya Ərzincan istiqamətində hücum etmək əmri verdi. Türk orduları 1918-ci il fevralın 12-də hərbi əməliyyatlara başladılar. Almanlar da fevralın 18-dən etibarən hərbi əməliyyatları bərpa etdilər. Bunun ardınca Almaniya fevralın 21-də Rusiyaya ultimatum verdi. Bununla da V.İ.Lenin hökuməti inqilabı ixrac etməklə bağlı fəaliyyətlərini bir qırağa qoyub, sülh imzalamağa məcbur oldu və Q.Sokolnikovun başçılığı ilə Brestə yeni bir heyət göndərdi.

Sovet heyətinin konfransı nəticəsiz tərk etməsi əslində Türkiyənin lehinə oldu. Bu vaxta qədər türk heyəti Sovetlər qarşısında maksimum tələblər irəli sürməkdən çəkinmişdi. Türklər bir tərəfdən almanlardan dəstək ala bilmir, digər tərəfdən də maksimum tələblər irəli sürməklə danışıqların kəsilməsinə səbəb olmaq istəmirdilər. İndi artıq sovet heyətinin göstərdiyi de-marş qarşısında danışıqlar yenidən başladıqda türklərin maksimum tələblərlə çıxış etməsi üçün əlverişli şərait yetişmiş olurdu.

Osmanlı hökuməti ruslara veriləcək yeni ultimatuma aşağıdakı türk tələblərinin salınmasını qərara aldı:

1. 1877-1878-ci illər müharibəsi nəticəsində Osmanlı dövlətinin ödəyə bilmədiyi müharibə təzminatının əvəzi olaraq Rusiyaya verməyə məcbur olduğu türk torpaqlarının – Qars, Ərdəhan və Batum vilayətlərinin Osmanlı dövlətinə qaytarılması;

2. Türklərin məskunlaşdığı bu bölgələrin rus orduları və qızıl birliklər tərəfindən boşaldılması, bu ərazilərdə ictimai asayiş və qayda-qanun təmin edilənədək bölgənin türk qüvvələri tərəfindən işğal edilməsi;

3. 1878-ci il sərhədlərinin qarşı tərəfində olan Qafqaz ərazisindəki müsəlmanların Sovet Rusiyasının elan etdiyi "xalqların öz müqəddəratını təyin etmək" prinsipindən yararlanması və onlara da bu haqqın tanınması.

Bu qərar 24 fevral 1918-ci il tarixində Ənvər paşa tərəfindən Brestdə olan Zəki paşaya və onun vasitəsilə Almaniya Baş Komandanlığına bildirildi. General Lüdendorf da Almaniya Baş Komandanlığının Brest-Litovskdakı təmsilçisi general Hoffmandan bu türk tələblərinin sülh konfransında dəstəklənməsini və müdafiə edilməsini istədi.

Alman hərbi komandanlığının əksinə olaraq, xarici işlər naziri Külman bu yeni türk tələblərini uyğun görmürdü və bildirirdi ki, həddindən çox böyük olan bu tələblər sülhü təhlükəyə sala bilər və bəlkə də Osmanlı-Rus toqquşmasına səbəb olar. Bununla belə, Külman türk istəklərinə qarşı çıxmağı da münasib bilmirdi. Nəticədə, aşağıdakı türk tələblərinin alman ultimatumu ilə birlikdə ruslara verilməsinə qərar verildi:

1. Rusların işğalı altında olan Şərqi Anadolu vilayətlərinin dərhal rus orduları tərəfindən boşaldılması;

2. 1877-1878-ci illər müharibəsi nəticəsində Osmanlı dövlətinin ödəyə bilmədiyi müharibə təzminatının əvəzi olaraq Rusiyaya verməyə məcbur olduğu Qars, Ərdəhan və Batum vilayətlərinin Rusiya ordu hissələri tərəfindən boşaldılması və bu ərazilərdə asayiş və qayda-qanun təmin edilənədək bölgənin türk qüvvələri tərəfindən işğal edilməsi;

3. İndiyə qədər Osmanlı dövləti ilə Rusiya arasında imzalanmış bütün müqavilələrin (xüsusilə iqtisadi sahədəki müqavilələrin) ləğvi.

İstanbul hökuməti Qafqazdakı bütün müsəlmanları Osmanlı dövlətinin himayəsi altında bir "İslam dövləti" halında birləşdirmək lazım idi. Bu məqsədlə Ənvər paşa tərəfindən Brestdəki türk nümayəndəsi İbrahim Hakkı paşaya da lazımi təlimat göndərilmişdi. 1918-ci il fevralın 27-də göndərilən təlimatda Qafqazla bağlı aşağıdakı tələblərin qəbul etdirilməsi istənilirdi:

"1. Qafqaz daxilində mövcud millətlərin öz müqəddəratlarını müstəqil təyin etməsi və heç bir halda daxili işlərinə müdaxilə edilməyəcəyinin təəhhüd olunması;

2. Rusiya daxilində təşəkkül edəcək digər müsəlman hökumətlərin də müqəddəratlarını təyində sərbəst olmalarının qəbul olunması".[1]

Qars, Ərdəhan və Batum vilayətlərinin Osmanlı dövlətinə qaytarılması ilə bağlı türk tələbləri almanlar tərəfindən qəbul edilib ruslara verilən son ultimatuma daxil edildikdən sonra Brest-Litovsk konfransının son mərhələsində, 27 fevral 1918-ci il tarixində İbrahim Hakkı paşa Rusiya heyəti qarşısında yeni tələblərlə çıxış etdi: "Sovet Rusiyasının elan etdiyi "xalqların öz müqəddəratını təyin etmək" hüququ əsas tutularaq, Qafqazda müstəqil bir "İslam dövləti" qurulmalıdır, həmçinin Kazan, Orenburq, Türküstan və Buxara müsəlmanlarının milli hökumətləri tanınmalıdır".

Osmanlı nümayəndə heyətinin mövqeyinə görə, Qafqazda Türkiyəyə bitişik bir müsəlman dövləti qurulmalı, bu dövlət Rusiya ilə Türkiyə arasında bir bufer dövlət rolunu oynamalı idi. Bu dövlətə Azərbaycan və Dağıstanın daxil edilməsi nəzərdə tutulurdu. Sovet heyəti bu təklifə qəti etiraz etdi. Almanlar da öz mənafeləri baxımından belə bir müsəlman dövlətini müvafiq görmədiklərinə görə, türk təklifini dəstəkləmədilər. Nəticədə

---

[1] BOA, HR. SYS, no. 2296/1, v. 61-62.

bu təklif qəbul edilmədi. Bununla belə, ruslar Qafqaz müsəlmanlarına geniş hüquqlar verəcəklərini vəd etdilər.

Osmanlı dövləti Brest-Litovsk konfransında yalnız bu tələblərlə kifayətlənmirdi. Türk heyəti yalnız Qafqaz müsəlmanlarını deyil, Rusiyadakı bütün türk-müsəlmanların Osmanlı dövlətinin himayəsi altına keçirilməsini istəyirdi. Onlar Rusiyadakı türklərə geniş siyasi və mədəni haqların verilməsini tələb edir və bunların tətbiqinə bir növ Osmanlı dövləti tərəfindən nəzarət edilməsini nəzərdə tuturdular. Onu da qeyd edək ki, Rusiyadakı türk-müsəlmanların haqlarının tanınması məsələsi ilk dəfə idi ki, beynəlxalq müstəvidə müzakirə olunurdu. Bütün bunlara baxmayaraq, türk heyətinin Qafqaz və bütövlükdə Rusiyada yaşayan bütün türk-müsəlman xalqları ilə bağlı tələbləri almanlar tərəfindən məqbul hesab edilmədi və dəstəklənmədi. Avstriya-Macarıstan nümayəndələri də türklərin bu tələbini sülh üçün təhlükə kimi qiymətləndirdilər və dəstəkləmədilər. Sovet nümayəndələri də Almaniya və Avstriya-Macarıstanın mövqeyindən istifadə edərək türk tələblərini rədd etdilər.

Brestdəki Osmanlı heyətinin rəhbəri İbrahim Hakkı paşa 2 mart 1918-ci il tarixində Tələt paşaya göndərdiyi teleqramında yazırdı: "…Brest-Litovskdakı bu ikinci toplantının məqsədi rusların qəbul etdiyi ultimatum şərtləri daxilində sülh müqaviləsinin imzalanması idi… Ruslara verilən ultimatumun hüdudlarını genişləndirməyə … imkan yoxdur.

Bu arada, Qafqaz və digər xüsuslarla bağlı hökmlərin andlaşmaya daxil edilməsi yolundakı bir çox əmr və təlimatlara, bu əlavələri qəbul etdirməyin mümkünsüzlüyünü bildirərək, cavablar ərz etdim. Sülh müqaviləsi sabah imzalanacaqdır. Hər şey imzalanmışdır. Bunu nə dəyişdirməyə, nə də ertələməyə imkan olmadığından sabah Müttəfiq heyət nümayəndələri ilə birlikdə imza edəcəyimizi ərz edərim.

Qafqaz haqqındakı teleqrafnaməniz alınar-alınmaz bu mövzuda da təkrar nəsə etmək imkanı qalıb-qalmadığı xüsusu alman nümayəndələri ilə müzakirə edildi. İşin başından son gününə qədər olayların ortaya qoyduğu durum belədir: Rusiyaya sonradan bir ultimatum verilə bilməz. 21 fevralda bir ultimatum verilmiş, Rusiya da bunu verilmiş zaman içində qəbul etmişdir. Beynəlxalq hüquq əsaslarına görə, adı keçən ultimatumda yer alan şərtlərin sonradan ağırlaşdırılmasına heç bir imkan yoxdur… Almaniya ultimatumun dəyişdirilməsinə imkan olmadığını İstanbuldakı səfiri vasitəsilə Osmanlı hökumətinə bildirmişdir… Qafqaz haqqında yenidən təkliflərlə çıxış etməyin imkansızlığı müəyyənləşmişdir. Bunu digər heyətlərə qəbul etdirmək xəyal olduğu kimi, ruslara da təklif etmək yeni bir ultimatum deməkdir və artıq buna imkan yoxdur…"

İbrahim Hakkı paşanın bu teleqramına ədliyyə naziri və xarici işlər naziri vəkili Xəlil bəy tərəfindən göndərilən 3 mart 1918-ci il tarixli cavabda deyilirdi: "Ənvər paşa tərəfindən Zəki paşaya da bildirildiyi kimi, Qafqazın istiqlalı haqqındakı təklifimizdən vaz keçdiyimizdən sülh andlaşmasını qərarlaşdırılan son şəkildə imzalamağınız uyğundur əfəndim".[1] Artıq Qars, Ərdəhan və Batum vilayətlərinin Osmanlı dövlətinə qaytarılması sülh şərtlərinə daxil edilmişdi. Osmanlı rəsmiləri də bununla kifayətlənib sülhü təhlükəyə salmamaq qərarına gəldilər. Qafqaz müsəlmanlarının müstəqilliyi məsələsi nəinki Rusiya, heç Osmanlı dövlətinin müttəfiqləri tərəfindən də dəstəklənmədi.

[1] BOA, HR.SYS, no. 2296/1, v. 97.

Nəhayət, 1918-ci il martın 3-də Brest-Litovskda Sovet Rusiyası ilə Almaniya, Avstriya-Macarıstan, Osmanlı dövləti və Bolqarıstan arasında 14 maddədən ibarət sülh müqaviləsi və bu müqaviləyə əlavə protokollar, həmçinin müttəfiqlərlə Sovet Rusiyası arasında ayrı-ayrılıqda sülh müqavilələri imzalandı.[1]

Brest-Litovsk müqaviləsinin Qafqazla bağlı IV maddəsində deyilirdi: "…Rusiya dövləti Şərqi Anadolu vilayətlərinin boşaldılması və Osmanlı dövlətinə müntəzəm bir şəkildə geri verilməsi üçün əlindən gələn hər şeyi edəcəkdir.

Ərdəhan, Qars və Batum vilayətləri Rusiya orduları tərəfindən dərhal boşaldılacaq. Rusiya dövləti bu ərazilərin yeni idarə formasına və hüquqi durumlarına qarışmayacaq. Bu bölgələrin gələcək idarə forması qonşu dövlətlər və xüsusilə Osmanlı dövləti ilə razılaşacaq yerli əhali tərəfindən müəyyən ediləcəkdir".[2]

Bununla da, Osmanlı dövləti Brest-Litovsk danışıqlarında qarşısına qoyduğu Qafqazla bağlı üç tələbindən ikisini – Şərqi Anadolu vilayətlərinin boşaldılması və Elviye-i Səlasənin Türkiyəyə qaytarılması məsələsini öz istəyinə uyğun şəkildə həll edə bildi.

Brest-Litovsk sülhündən sonra Osmanlı dövlətinin Qafqaz siyasətində yeni mərhələ başlandı. Bundan sonra Türkiyə Qafqazda daha fəal siyasət yeritməyə başladı. Həmçinin, Brest sülhünü imzalayıb müəyyən qədər nəfəs alan Sovet Rusiyası da bölgədə fəallaşdı. Artıq bu dövrdən başlayaraq Osmanlı dövləti Zaqafqaziya Seymi ilə Sovet Rusiyası arasında yaranmış gərginlikdən istifadə edərək, həmçinin Rusiya imperiyası ərazisində yaşayan türk-müsəlmanların, xüsusilə də Qafqaz müsəlmanlarının Rusiyaya qarşı apardıqları azadlıq mübarizəsini dəstəkləyərək bölgədə İstanbula bağlı rejimlər qurmağa girişdi.

## ARXİV SƏNƏDLƏRİNİN TRANSKRİPSİYASI

**№ 20**

[17 yanvar 1918]
Ambassade Impériale Ottomane
à Berlin
S.E. Enver Pacha, Constantinople
à S.A. Talat Pacha, Brest Litowsk

№ g □ [1]

Objet:

Bolşeviklerin Kafkas cebhesinde vaz'iyete ve orduya hâkim olmadığı ve Brest-Litowsk'da düvel-i müttefika murahhaslarına bu cebhe için ta'ahhüdde bulundukları mevâddı tamâmen icrâya muktedir bulunmadıkları mezkûr cebhede ahvâl ve vekâyi'-i âhire ile sâbit olmakdadır. Bu hâlde bizim Kafkasya cebhemize â'id metâlibi Brest-Litowsk müzâkerâtındaki Rus murahhasları vâsıtasıyla istihsâl etmez isek Almanların metâlib-i hâliyelerini tahfîf için yapılacak teşebbüsün bize bir fâ'idesi olmayacakdır.

---

[1] BOA, HR. SYS, no. 2294/10; HR. HMŞ. İŞO, no. 107/10.

[2] BOA, HR. SYS, no. 2294/10; HR. SYS, no. 2296/1; HR. SYS, no. 2297/1, 4.

Buna mukâbil Almanlara bu bâbda mümâna'at belki Almanların bize mu'âvenetine sû-i te'sîr etmek bizim ileride çoğalacak metâlibimizin istihsâli husûsunda onların yardımını azaltır. Mütâla'a-ı sâmîleri de bu merkezde ise Kafkasya cebhemizde sulhun ve metâlibimizin te'mîn ve istihsâli için başka bir tarîk ve husûsî bir çâre-i hâl iktizâ edecekdir.

Enver

HR.SYS, no. 2397/5, v. 37.

***** ***** *****

**№ 21**

[19 yanvar 1918]

Hâriciye Nezâreti Vekâlet-i Celîlesi'ne

Sûreti Enver Paşa Hazretleri'ne

Nesîmî Beyefendi dün sabâh Troçki ile uzun uzadıya görüşmüşdür. Seyâhatının esâsını mübeyyin ve rufekâsı tarafından imzâ olunub Pravda gazetesinin neşr eylediği ma'hûd dekere teşkîl eylemişdir. Ma'lûm olduğu vechle bu dekereye göre Türkiye Ermenistan'ında Ermeniler kemâl-ı serbestî i'ta-ı re'y edebilmek için Rus ordusu çekilince onun yerine bir Ermeni milisi ikâme edecek ve demokrasi esâsâtı dâ'iresinde müntehab, kezâlik Ermeni bir meclis tarafından icrâ-yı hükûmet olunacakdır.

Ermenilerin teslîh edildikden sonra bu sûretle arâzî-i meşgûlede hâkim kılınması bu yerlerde ekseriyyeti hâ'iz olan ahâlî-i islâmiyenin envâ'-ı mezâlime ve hattâ katl-i'âmmlere ma'rûz kalmasını intâc edeceğine asla şübhe edilmediğinden bunun mes'ûliyeti doğrudan doğru bugünkü Rus Cumhûriyeti'ne râzî olacağı, Rusya'ya mensûb olmayan bir memleketin ahâlîsini teslîh ederek i'lân-ı istiklâle sevk ve icbâr etmek Rus inkılâbının ileri sürüb, Rus murahhasları tarafından müdâfa'a ve îzâh edilmesi makâsid ve esâsâta dahi asla tevâfuk etmediği ve muhârebenin nihâyetine kadar hey'et-i müttefikamızın bütün hudûdları bir küll teşkîl edib, Rusya tarafından Asya'da bilâ-kayd ü şart bize i'âde edilecek arâzîye mukâbil Rusya'ya â'id olub, Avrupa'da Almanların taht-ı işgâlinde bulunan arâzînin kısm-ı a'zamı yine bilâ-kayd ü şart hemân Ruslara i'âde edileceği ve Türkiye ve müttefikleriyle sulh müzâkerâtına Rus Cumhûriyeti müdîrânı bu tarzda hareket etmekle pek âşikâr bir siyâset-i hasımâneye tevessül etmiş olacaklarından arzu edilen sulhun husûlünü işkâl ve hattâ tamâmen tehdîd edeceği ve esâsen bu mes'elelere yeni devlet hey'et-i murahhasalarınca tedkîk edilmeden mukaddem o havâlîdeki ahâlînin ekseriyyetine ve sâ'ir teşkîlât-ı ictimâ'iyye ve münâsebât-ı târihiyyelerine bakmaksızın mukadderâtını keyfiyeti bir daha doğru ve ciddî bir sûretde değişdirmeğe ve bizi bir emr-i vâki' önünde bulundurmağa kalkışmak netâyici pek mü'essif bir takım vekâyi'in zuhûruna sebebiyet vereceğini nazar-ı te'emmüle almak iktizâ eylediği bu kabîl teşebbüsâtdan hıfz ediliyor ise Rus inkılâbının i'lân edildiği perensiplere göre marzî, muvâfık olacağı daha bir hayli efkâr ve mülâhazat ilâvesiyle beyân ve asl-ı sebeb-i mülâkâtın dahi bu vekâyi'-i mü'essife hakkında nazar-ı dikkatini celb etmekden ibâret olduğu ilâve edilmişdir.

Troçki cevâben Ermenileri müsellah olan Kürdlere karşı kendilerini müdâfa'a edebilmek için teslîh etdiklerini ve bu sûretle Ermenilerin müsellah olduklarını ve onlara karşı bir şey yapamayacaklarını görecek olan Kürdlerin Ermeniler ile bir te'mîn-i i'tilâf aramağa ve onlar ile iyi geçinmeğe mecbûr olacaklarını ve ma'a-mâ-fîh bahs edilen

muhtemel vekâyi‘ hakkında nazar-ı dikkati celb olunduğundan dolayı teşekkür eylediğini ityân eylemişdir.

Muhârebeden beri o havâlîde ahvâlin tamâmiyle değişdiği ve Ermenilere karşı hareket edecek Kürdlere bundan sonra tesâdüf edilmeyeceği ve bu husûsda tamâmiyle müsterîh olabileceği ve Hükûmet-i Seniyye'nin Ermeniler hakkında gâyet hayır-hâhâne ba‘zı tedâbîr ittihâz etmek üzere olduğu cevâbı verilmişdir.

Buna karşı İstanbul'a â'id olub eski Çar Hükûmeti tarafından akd edilmiş olan mu‘âhedât-ı hafiyyeyi en evvel kendsi redd eylediğini ve bundan dolayı Fransa'dan bile teb‘îd edilmiş olduğunu ve Türkiye'ye karşı hesâbât-ı dostâne ile mütehassis olmakla berâber mübeyyen ve ma‘lûm olan prensiplerden dahi ayrılmak kâbil olmadığını ve aynı prensiplerin daha ağır şerâ'it tahtında ya‘nî asâkir-i işgâliye çekilmeksizin ta‘dîlâta ve arâzî-i ma‘lûma-ı sâ'irede müttefiklerimiz tarafından tatbîk olunmakda ısrâr edildiğini ve ma‘a-mâ-fîh bahs olunan muhtemel vekâyi‘-i mü'essife hakkında nazar-ı dikkati celb olunduğundan dolayı tekrâr teşekkür eylediğini söylemişdir.

Türkiye'ye karşı olan bu hissiyâtına teşekkür etdiği ve Rusya'dan tekrârlandığında iki hey'et-i murahhasa beyninde bu husûsda müzâkerât cereyân edeceği tabî‘î olduğundan derhâl ol-vakite kadar bu bâbdaki teşebbüslerini ta‘tîl etmek iktizâ etdiğinde ısrâr edildikden sonra mübâhase Kafkasya a‘dâsına nakl olunmuşdur.

Kafkasya'da bir hayli hükûmetler teşekkül etmek üzere ise de şimdiye kadar hiçbirini kabûl ve tasdîk etmediklerini ve ma‘a-mâ-fîh Kafkasya Ordusu'nda tehâsubün emrlerine mutî‘ olduğunu söylemişdir.

İşbu müzâkereden Enver Paşa Hazretleri'ne de cevâben yazıldığı vechle Rusya'dan arâzî-i meşgûlemizi teslîm etdirecek olan Ermenilere karşı kuvve-i askeriye sevk etmek mecbûriyetinde kalacağına hakîkat anlaşılmış olmakla şimdiden bunun esbâbını te'emmül ve inhısâr etmek ihtârındayız.

Dün sâ‘at onbirde Ukraynalılarla ictimâ‘ etdik. Cereyan eden müzâkerâtı ayrı bir telgrafla arz ederiz.

Troçki akşam Petersburg'a avdet etdi. Son ictimâ‘da Almanların bir takım nâmlar altında ilhâk-ı arâzî etmek niyetinde olduğunu anladığından bu ciheti rufekâsıyla müzâkere etmek mecbûriyetinde olduğunu beyân eylemişdir. Meclis-i Müessesân münâsebetiyle gitmek zarûretinde olduğu anlaşılıyor. Kânûnusânî'nin yigirmi dokuzunda avdet edecekdir. Bu müddet zarfında Ukraynalılarla görüşeceğiz. Müzâkere bir şekl-i kat‘î oldukdan sonra onların da Kiev'e gitmeleri ihtimâli vardır. Demek ki biz beş-altı gün Brest-Litowsk kal‘asında intizâr-ı mevki‘de kalacağız. Bu sabâh ubûriyetim hakkında uzun uzadıya düşündük. Almanlar ve Ruslar müzâkereyi kat‘ etmediler. Troçki avdetinde ya Almanların teklîfini kabûl edecek ve yâhûd yeni bir formül ile gelecek. Czernin, Kühlmann üzerinde her türlü tazyîki icrâ etdiği hâlde Almanların tebdîl-i fikr etmelerine muvaffak olamadı. Hükûmet bir karârgâh-ı ısrâr tarîkat-ı muvakkata olunacağında ittifâk etmiş olduğu görülmekdedir. Czernin'in ümidi iş kat‘-ı münâsebet derecesine getirilmeyeceğindedir. Şâyed o tehlikeyi görür ise feryâda başlayacağı anlaşılıyor. Viyana'da Brest müzâkeresinden dolayı grevler yapılmakdadır. Czernin'in feryâdı Troçki'nin avdetinden sonra başlayacakdır. Belki o vakit müttefikler arasında şiddetli münâkaşalar cereyân edecekdir. Biz şimdiye kadar bu mes'elede Almanlara karşı kat‘î bir lisân kullanmağı menâfi‘-i âtiyemize muvâfık bulmadık. Bu vazîfeyi Czernin hasta olacak derecede îfâ

etmekdedir. İşte son zamânda benim burada bulunmaklığıma Nesîmî Bey lüzûm görüyor. Diğer tarafdan arâzî-i meşgûlemizin te'mîn-i tahliyesi için de çalışmak îcâb ediyor. Burada kalmaklığım ancak bu esbâb[a] vârid-i mülâhazadır. Diğer tarafdan İstanbul'a avdet ederek bütün bu ihtimâlâtı birlikde düşünerek, oradan hâle göre îcâb eden te'sîri yapmak ve meclisin hıtâmesi takarrub etmekde olduğundan büdce-i âtî müzâkeremizde hâzır bulunmak ve meclis hakkında bir karâr vermek ciheti vârid-i mütâla'a olunuyor. Bu cihetleri sizin de arîz ve amîk düşünerek ve her husûsu nazar-ı dikkata alarak bana hulâsaten müzâkerâtınızı bildirmenizi ricâ ederim.

Fî 19 Kânûnusânî sene [1]334
Sadrazam
Mehmed Talat
HR.SYS, no. 2397/5, v. 42, səh. 1-3.

***** ***** *****

**№ 22**

[28 yanvar 1918]
Hotel Adlon, Berlin le
Vinter den Linden 1
am Pariser Platz
Ma'rûz-ı çâker-i kemîneleridir ki,

Prens Maçabelli ile birlikde birkaç Gürcü bugün hotele bendenizi görmeğe geldiler. Kafkasya'nın ahvâline, Gürcistan'a dâ'ir müdâvele-i efkâr olundu. Mutâlebât-ı âtiyede bulundular:

"Biz Gürcüler Tiflis'de hükûmetimizi teşkîl etdik. Brest-Litowsk'a da bir delegasyon göndermek istedik. Demiryolları tahrîb edilmiş, bütün Kafkasya iğtişâş içinde bulunduğu için azîmetlerine imkân bulunamadı. Ermenilerle Türkler arasındaki mübâyenet, husûmet pek eski değildir. Fakat Ermenilerle Gürcüler hiçbir vakit uzlaşamamışlar. Aralarındaki münâferet-i husûmet asırlardan beri devâm ediyor. Ruslar bizi ezmek için Ermenileri âlet ederler. Ermeniler de Ruslara istinâden hukûkumuza ta'arruz ederlerdi. Şimdi de Amerika ve İngiliz acanları vâsıtasıyla teslîh olundular. Müslüman Gürcülere, sâ'ir İslâm ahâlîye, hattâ münferiden yaşayan Hıristiyan Gürcülere de etmedikleri zulüm kalmamışdır. Eğer Devlet-i Aliyye arzu eder, kaviyyen zann ederiz ki, menfa'ati de bunu istilzâm eyler, münâsib bir yerde Batum'da yâhûd Samsun'da Gürcistan'la müzâkerât-ı sulhiyyeye girişmek için delege irsâlini teklîf ederse, Gürcüler derhâl da'vete icâbet eylerler, çarçabuk müsâlaha akd olunur. Ermenilerin def'-i mazarratı için ittifâk da ederiz. Mu'âvenetinize istinâden Ermenilerin her türlü tecâvüzâtını def'-i kuvvet ve nüfûzlarını kesr ü mahv eyleriz. Buna bedel Batum, Çürüksu ve Acara'nın diledikleri tarzda bir otonomiye sâhib olmak şartıyla Gürcistan'dan ayrılmasına Devlet-i Aliyye çalışmamalıdır. Kars, Ardahan ve civârı ile Gürcü lisânını konuşmayan Lîvâne'nin ba'zı aksâmını ilhâka kanâ'at eylememelidir. Böylece tarafeyn arasında serî'an bir müsâlaha akd olunduğu takdîrde Gürcistan ile Memâlik-i Osmâniye beyninde mürâselât açılır, karadan denizden ticâret başlar, ahâlînin gaz ve sâ'ir ihtiyâcâtı tehvîn edilir. el-Yevm Brest-Litowsk'daki müzâkerât netîcelenmezse Devlet-i Aliyye için Gürcüleri Ruslara karşı isti'mâle bile muvaffakıyyet hâsıl olur. Teşkîl etdiğimiz hükûmet pek küçük, Devlet-i Aliyye gibi kavî

bir komşunun muzâheretine muhtâcdır. Batum, Acara'dan mahrûm edilirsek te'mîn-i sıyânet edemez. Devlet-i Aliyye bizi kendisine bağlamalı, minnetdâr etmelidir" dediler.

Bu bâbda daha ziyâde tafsîlât ve îzâhât taleb ve tensîb buyurulduğu takdîrde Maçabelli Brest-Litowsk'a kadar gelmeğe âmâde bulunduğunu ilâve eyledi. İstanbul'da da bir komisyon teşkîl ederek bu işin ta'kîb olunabileceğini söyletdik. Huzûr-ı fehîmânelerindeki karâr-ı vechle bu cum'a İstanbul'a avdet edeceğiz. O zamâna kadar işbu arîzama karşı bir emrinize intizâr edebilir miyim? Bâkî takdîm-i ihtirâmât eylerim efendimiz hazretleri.

Fî 28 Kânûnusânî sene 1918

Çürüksulu Ahmed

HR.SYS, no. 2397/6, v. 9, səh. 1-2.

***** ***** *****

**№ 23**

[7 fevral 1918]

Enver Paşa Hazretleri'ne

C.: 25-22-24 numaralı telgraf-nâmeden: İzzet Paşa Hazretleri'ne hitâben yazılan telgraf-nâme-i devletleri de mütâla'a edildi ve birlikde görüşüldü. 27 numaralı telgraf-nâme ile de arz olunduğu vechle mevcûd kuvvetimiz kâfî geldiği takdîrde arâzî-i meşgûlemizi istirdâd etmeğe hiçbir mâni'-i siyâsî mevcûd değildir. Yalnız işin resmiyete vaz'ı için Kühlmann'la Gzernin Ukraynalılarla sulh mu'âhedesinin imzâsına kadar intizâr edilmesini tavsiye etmişlerdi ki o da bu gün yarın netîcelenecekdir. Telgraf-nâme-i sâmîlerinde iş'âr buyurulan vekâyi'-i fecî'a karşısında daha ziyâde seyirci kalmak câ'iz olamayacağından verilen emrin musîbet-i emniyetde ordunun ilerlemesi keyfiyetini Ukraynalılarla sulh mu'âhedesi imzâsına kadar te'hîrini Kühlmann ve Gzernin tavsiye etmiş ve biz de kabûl etmiş olduğumuzdan hareket emrinin tarafımızdan iş'âr-ı vukû'una ta'lîki elzemdir. Esâsen iki güne kadar Ukraynalılar akd-ı müsâlaha etdirilerek Bolşevik-lere bir ültimatom verilecek ve bu sûret ile mütârekenin Almanlar tarafından ihlâli muhakkak olduğundan yeniden harbe sebebiyet vermiş olamayız. Yalnız burada gâyet mühim iki noktayı nazargâh-ı devletlerine ehemmiyyetle arz etmek mecbûriyetindeyim:

1. Ordu teveccüh etdiği her hangi bir istikâmetde maksadına muvaffak olmalı;

2. Ordunun istirdâd ve işgâl eylediği yerlerde ahâlî-i ma'sûmeye karşı görülmemiş bir sûretde te'min-i adâlet edilerek çeteciliğe ve yağmagirliğe sûret-i kat'iyyede meydân verilmemeli ve hattâ ahâlî-i hıristiyaniyenin bir kısmının tarafımıza celbine gayret olunmalı.

Gürcülerin Ermenilerle müttefikan hareket etdiklerine ve bizim arâzî dâhilinde ahâlî-i islâmiyeye tecâvüz eylediklerine dâ'ir elimizde ma'lûmat-ı hakîkiye yokdur. Gürcülerle anlaşarak ve birlikde hareket ederek Ermenistan mes'elesine ile'l-ebed nihâyet vermek imkânını tamâmen görmekdeyiz. Evvelce de arz olunduğu vechle buna hemân teşebbüs edelim. Prens Maçabelli ile uzun uzadı görüşdük, bu müzâkerede bu bâbdaki kanâ'at te'eyyüd eyledi. Cereyân eden müzâkere protokolünü zîre aynen derc ediyorum: Protokole bi't-tab'i imzâ-ı vaz' olunmamış ise de kendisine te'mînât-ı lâzıme verilmişdir. Prens bir haftaya kadar İstanbul'a hareket edecekdir. Muvâsalatından evvel esbâb-ı seyâhatine â'id tedâbîr-i lâzımenin ittihâz buyurulmasını istirhâm eylerim efendim.

7/[0]2/[1]918

HR.SYS, no. 2397/6, v. 14.

***** ***** *****

**№ 24**

[7 fevral 1918]
Ambassade Impériale Ottomane
à Berlin
S.E. Enver Pascha, Cons[tantino]ple
à.S.A. 52Talaat Pascha, Brest-Litowsk
le 7 Février 1918
Numara : 26

Kafkasya'dan gelen son havâdise göre, Ermenilerin Gürcülerle arası açılmağa başladığından Rusya dâhiline çekilmeğe başladıkları ve ahâlî-i islâmiye ve Gürcülerin yine müttehiden çalışdıkları anlaşılıyor. Binâen'aleyh Maçabelli ile Batum ve Kars hakkında şimdilik bir şey karârlaşdırılmayarak mûmâ-ileyhin buraya i'zâmı ve vaz'iyete göre hatt-ı hareket ta'yînini daha münâsib görüyorum.

Enver
HR.SYS, no. 2397/6, v. 15.

***** ***** *****

**№ 25**

[27 fevral 1918]
Bâb-ı Âlî
Hâriciye Nezâreti
Kalem-i Mahsûs
27 Şubat sene [1]918
707

| | | | | | |
|---|---|---|---|---|---|
| Evveliyât ve Müzeyyelât | | Kâtib | Mümeyyiz | Müdîr | Melfûfât |
| Hulâsa | | | | | |
| Müstenid Olduğu Evrâk | | Nev'-i Müsvedde: | | | |

| | |
|---|---|
| Umûmî Numara: 2170<br>Husûsî Numara: 44<br>Târîh: fî 27 Şubat sene [1918 | |
| Keşîde edildi | |

Brest Litowsk’da Berlin Sefiri Hakkî Paşa Hazretleri’ne

107 numaralı telgraf-nâme-i âcizanem ile arz etdiğim teklîfâtımıza zamîmeten, sulh mu‘âhedesine derci Meclis-i Vükelâca tensîb edilmiş mevâdd ber-vech-i zîr arz olunur.

1. Kafkasya dâhilinde mevcûd milletlerin mukaderâtlarını müstakillen ta‘yîne ve hiçbir vesîleyle umûr-ı dâhiliyelerine müdâhale edilmeyeceğinin ta‘ahhüd olunması.

2. Rusya dâhilinde teşekkül edecek sâ’ir Müslüman hükûmetlerin de mukadderâtını ta‘yînde serbest olmalarının kabûl olunduğu.

Keşîdesi fî 27 Şubat sene 1334

HR.SYS, no. 2296/1, v. 61.

***** ***** *****

**№ 26**

[27 fevral 1918]

Zeyil Numara : 107

Berlin’e Şifre

Hakkî Paşa Hazretleri’ne

I – Kafkasya’nın istiklâlinin tanınması ve hiçbir vesîleyle umûr-ı dâhiliyesine müdâhale edilmeyeceğinin ta‘ahhüd edilmesi,

II – Rusya dâhilinde teşekkül edecek sâ’ir Müslüman hükûmetlerin mukadderâtlarını ta‘yînde serbest olmalarının kabûl ve tasdîki,

Bununla evvelki telgrafın Enver Paşa’ya bir sûretinin gönderilmesi.

HR.SYS, no. 2296/1, v. 62.

***** ***** *****

**№ 27**

[2 mart 1918]

Harbiye Nezâreti

Tahrîrât Dâiresi

Tahrîrât Kalemi

844

De S. E. Halil Bey

à S. A. Hakky Pacha

Brest-Litowsk

Le 2 Mars 1918

6 numaralı telgraf-nâmenizi aldım. Üç sancak hakkında takrîr edilen formulünüzü kabûl ederiz. Kafkasya'da mevcûd milletlere â'id teklîfimizde ısrâr ediyoruz. Alman sefîrine ben söylediğim gibi Enver Paşa Hazretleri de Lüdendorff'a yazdı. Zât-ı devletleriniz de müttefik murahhaslar nezdinde ısrâr buyurunuz ve müşterek teklîf olarak Ruslara teblîğ etdirmeniz müsterhamdır. Rusya dâhilindeki diğer Müslüman milletlere â'id teklîfimizde ısrâr etmiyoruz. Kafkasya'da teşekkül eden hükûmet-i cümhûriye de resmen bize müzâkere-i sulhiyye için teklîfde bulundu. Murahhasları da Trabzon'a Mart'ın on yedisinde geleceklerdir. Evvelce Troçki de Kafkasya'daki milletlerine mukadderâtlarını kendilerinin ta'yîn eylemesi esâsını kabûl etmiş idi. Himmet ve gayret-i devletlerinden mes'elenin marzîmiz dâ'iresinde hüsn-i int'acını cümlemiz ümid ve intizâr ediyoruz efendim.

Halîl

HR.SYS, no. 2296/1, v. 75-77.

***** ***** *****

**№ 28**

[3 mart 1918]
Bâb-ı Âlî
Hâriciye Nezâreti
Kalem-i Mahsûs
3 Mart sene [1]918
722

<table>
<tr><td>Evveliyât<br>ve<br>Müzeyyelât</td><td></td><td>Kâtib</td><td>Mümeyyiz</td><td>Müdîr</td><td>Melfûfât</td></tr>
<tr><td>Hulâsa</td><td></td><td></td><td></td><td></td><td></td></tr>
<tr><td>Müstenid<br>Olduğu<br>Evrâk</td><td></td><td colspan="4" rowspan="2">Nev'-i Müsvedde:</td></tr>
<tr><td colspan="2">Umûmî Numara:<br>Husûsî Numara:<br>Târîh</td></tr>
</table>

Brest-Litowsk'da Hakkî Paşa Hazretleri'ne
Telgraf-nâme
İki mart târîhli telgraf-nâme cevâbıdır:

Enver Paşa tarafından Zekî Paşa'ya bildirildiği vechle Kafkasya'nın istiklâli hakkındaki teklîfimizden sarf-ı nazar etdiğimizden mu'âhede-i sulhiyyeyi takarrur eden son şekilde imzâ buyurunuz. Münâsibdir efendim.

Yazıldı: fî 3 Mart sene [1]334

Rûşen işâret ile keşîde edilmek üzere Karârgâh-ı Umûmî Telgraf-hânesi'ne gönderilmişdir.

Fî 3 minhû.

HR.SYS, no. 2296/1, v. 97.

***** ***** *****

**№ 29**

[29 mart 1918]
Bâb-ı Âlî
Hâriciye Nezâreti
Şifre Kalemi
748
Fî 29 Mart sene [1]918 Târîhiyle Berlin Sefîri Hakkî Paşa Hazretleri'nden
Vârid Olan 212 Numaralı Telgraf-nâmenin Hallidir.
Mahremdir.
Cevâb numarası : 40

İ'tâ buyurulan ma'lûmâtdan dolayı arz-ı şükrân ederim. Rusya Hükûmeti sözde ahâlînin ta'yîn-i istikbâl etmeleri hakkını tasdîk eylemiş ise de Finlandya ve Ukrayna haklarındaki mu'âmelâtdan anlaşıldığı üzere bu lafzî bir keyfiyetdir ve hakîkatde Bolşevikler dahi çarları kadar emperyalistdir. Biz de Rusya ile mu'âhid ve musâlih olduğumuzdan Rusya tasdîk etmeden evvel Kafkasya Hükûmeti'ni tasdîk eder isek Rusya'ya karşı pek dostâne bir hareket olmaz fikrindeyim. Bu tasdîkden te'ennî ve hiç olmazsa istiklâlin bir emr-i vâki' ve zâhir olmasına intizâr-ı muvâfık maslahat olur husûsuyla ki Rusların Finlandya ve Ukrayna'ya yapdıkları mu'âmeleyi Kafkasya'ya yapmamaları ve bu cumhûriyet-i cedîdenin tam Elviye-i Selâse'nin tagayyur-ı hâline i'tirâzı zamânında zuhûru ve Kafkasya'da ekseriyetle ahâlî Müslüman iken, bu hükûmetin Ermeni ve Gürcü anâsırıyla tezâhürü bu işde bize ve müktesebât-ı ahîremize karşı bir tertîb vücûdundan dahi şübhe etdirebiliyor. Buradaki mesmû'âtım esâsen kuvve-i teşebbüsece Ermeni ve Gürcülerden pek dûn olan Kafkas Müslümanlarının diğerlerinin taht-ı nüfûzunda olduklarını zann etdirecek sûretdedir. Bendeniz evvel ve âhir arz olunduğu üzere üç sancağın tedâbîr-i hakîmâne ile evvel-i emrde elde edilmesi ve orada kimseyi tevhîşi ve tedhîşi eylemeyecek pişkin ellerde bir idâre-i muvakkatanın vücûda getirilmesi ve Kafkasya Hükûmeti'ni tasdîkde eğer bu hükûmet bir nev' Ermeni devlet ise hiç isti'câl gösterilmemesi ve eğer İslâm nüfûzu gâlib ve hiç olmazsa mahsûs ise o zamân tasdîk-i resmî Rusya'ca keyfiyetin hiç olmazsa kabûl-ı fi'lîsine kadar bi't-ta'lîk fakat münâsebât-ı fi'liyyede bulunulması ve ma'a-mâ-fîh Batum ele geçince Karadeniz ticâreti açıldığından derhâl porfran i'lân edilmesi münâsib olacağını zann etmekdeyim.

HR.SYS, no. 2450/4.

***** ***** *****

## 1.3. Azərbaycanda xaotik vəziyyət və Nağı Şeyxzamanlının İstanbul səfəri

1917-ci il Oktyabr çevrilişindən sonra bütün keçmiş rus imperiyası ərazisində olduğu kimi Cənubi Qafqaz bölgəsində də anarxiya tüğyan edirdi. Mövcud şəraitdə müsəlmanlara qarşı erməni-bolşevik təcavüzünün genişlənməsi Azərbaycanın siyasi qüvvələrində müsəlman əhalinin təhlükəsizliyini qorumaq məqsədilə Osmanlı dövlətinin hərtərəfli yardımına üz tutmaq meylini gücləndirdi. Faktiki olaraq Azərbaycan xalqı təklənmişdi və mövcud olan erməni-bolşevik təhlükəsi ilə təklikdə mübarizə aparmaq mümkün deyildi. Bu obyektiv həqiqəti lazımınca qiymətləndirən Cənubi Qafqazın müsəlman əhalisinin nümayəndələri hələ 1917-ci ilin noyabrında Mosulda yerləşən 6-cı türk ordusunun qərargahına gəlmiş və türk hərbçilərindən quduzlaşan daşnak qüvvələrinə qarşı mübarizədə yardım göstərilməsini xahiş etmişdilər. Bir qədər sonra isə 6-cı türk ordusundan bir əsgəri heyət Gəncəyə gələrək vəziyyəti yerində tədqiq etmişdi.

Azərbaycan milli azadlıq hərəkatının liderləri də 1918-ci ilin əvvəllərindən etibarən Osmanlı hərbi yardımının əldə edilməsi istiqamətində əməli addımlar atmağa başlamışdılar. 1918-ci ilin yanvarında Gəncədə keçirilən Müsəlman Milli Komitəsinin iclasında Azərbaycanın müxtəlif bölgələrindən gələn nümayəndələr bu məsələni geniş müzakirə etdilər. Yığıncaqda çıxış edən Nəsib bəy Yusifbəyli mövcud vəziyyəti şərh edərək aşağıdakıları söylədi: “Xalqın qüvvəsi ilə görülən işlər xalqın gözünün önündə cərəyan etmişdir. Bütün hərəkətimiz zəfərlə nəticələnmişdir. Ancaq bu qəhrəmanca hərəkətlər nəticəni əldə etməkdən çox uzaqdır. Bir kərə Azərbaycan mərkəzi Bakı düşməndən təmizlənməlidir. Çünki başsız bədən olmaz və yaşamaz. Bizim xalq qüvvələrimiz bunun üçün kifayət deyildir. Böyük bir yardıma ehtiyac vardır və bu yardımı da bizə bircə Osmanlı imperatorluğu edə bilər. İndi qərar qəbul edib, Osmanlı imperatorluğuna səlahiyyətli bir heyət göndərək. Türkiyədən yardım istəyək”.

N.Yusifbəylinin bu sözləri sürəkli alqışlarla qarşılandı. Bu təşəbbüsün müsbət olacağına bütün toplantı iştirakçıları inanırdılar. Osmanlı imperatorluğuna səlahiyyətli heyət göndərilməsi üçün Milli Komitəyə tam səlahiyyət verildi. Milli azadlıq hərəkatının fəallarından olan Nağı bəy Şeyxzamanlı Azərbaycan xalqının istəyini Osmanlı rəhbərlərinə çatdırmaq üçün səlahiyyətli nümayəndə təyin edildi.

1918-ci ilin yanvarında Gəncədən yola düşən N.Şeyxzamanlı səfərinin məxfiliyini təmin etmək üçün təhlükəsizlik tədbirlərinə əməl etmək məcburiyyətində qaldığından İstanbula yalnız mart ayında çatdı.

Cənubi Qafqaz müsəlmanlarının nümayəndələri kimi Osmanlı paytaxtına gedən Nağı Şeyxzamanlı və Ömər Faiq Nemanzadənin İstanbula çatana qədər keçdikləri Samsun, Sivas, Konya, Kayseri və Mudanya vilayətlərinin valiləri tərəfindən onların hərəkət marşrutu haqqında Osmanlı Daxili İşlər Nazirliyinə teleqramlar göndərilmişdir.[1] Valilərlə Osmanlı Daxili İşlər Nazirliyi arasında gedən teleqramlaşmalardan aydın olur ki, heyət

[1] BOA, DH.ŞFR, no. 578/23; DH.ŞFR, no. 84/100.

dörd nəfərdən ibarət olmuşdur. Amma N.Şeyxzamanlı və Ö.F.Nemanzadədən başqa heyətdə olan digər nümayəndələrin adları açıqlanmır. Teleqramlardan anlaşıldığına görə, bu heyət Cənubi Qafqaz müsəlmanlarının arzu və istəklərini Osmanlı siyasilərinə çatdırmaq və öz ölkələrinə Osmanlı yardımını təmin etmək üçün İstanbula gəlmişdir.

Ö.F.Nemanzadə hələ İstanbula çatmamış Osmanlı sədrəzmi Tələt paşaya və hərbi nazir Ənvər paşaya Qafqazdakı vəziyyətə dair bir məktub göndərir. Məktubun üstündə yazılma tarixi qeyd olunmayıb. Amma bu məktubla bağlı gedən yazışmalardan anlaşılır ki, məktub 1918-ci ilin 20-23 fevral tarixləri arasında yazılıb və martın 2-də Sivas valisi Süleyman Nəcmi bəy tərəfindən teleqramla İstanbula göndərilmişdir.[1]

Məktubda qeyd edilir ki, "1918-ci ilin fevralında Cənubi Qafqaz Rusiyadan ayrılıb öz parlamentini təşkil etsə də, faktiki olaraq, Cənubi Qafqaz vilayətləri müsəlman, gürcü və erməni milli komitələri tərəfindən idarə olunur. Qafqazda böyük bir anarxiya hökm sürür. Bakı və Gəncə vilayətləri tamamən, Qars, İrəvan və Batum vilayətləri isə qismən müsəlmanların əlindədir. Qars və İrəvan şəhərləri hələlik ermənilərin, Batum isə xristian gürcülərin əlindədir. İngilislər ermənilər vasitəsilə Osmanlı ordularının Qafqaza daxil olmasının qarşısını almağa çalışırlar". Məktubda həmçinin, müsəlmanların cəbhədən dönən rus ordusunu Tiflis-Bakı dəmir yolunda tərkisilah etmələrinə diqqət çəkilir və hazırki vəziyyətdə Cənubi Qafqazda milli zəmində yaradılmaqda olan orduların potensialı müqayisə edilir və gürcü-erməni ittifaqından bəhs edilir. Məktubun sonunda Qafqaz Azərbaycanı ilə İran Azərbaycanını birləşdirmək üçün münasib zamanın yetişdiyi vurğulanır və Osmanlı siyasilərindən bu tarixi fürsəti qaçırmamaq xahiş edilir.[2]

Uzun yolçuluqdan sonra İstanbula çatan N.Şeyxzamanlı və Ö.F.Nemanzadə baş nazir Tələt paşa ilə görüşdülər. Bu görüşdə həmçinin, baş komandan vəkili və hərbi nazir Ənvər paşa və ədliyyə naziri Xəlil bəy də iştirak edirdilər. N.Şeyxzamanlı Müsəlman Milli Komitəsinin və eyni zamanda, bütün Azərbaycan xalqının arzu və istəklərini Osmanlı hökumət rəhbərlərinə çatdırdı. Söhbətin gedişində məlum oldu ki, bu qəbuldan bir gün əvvəl Tələt paşanın hökumət kabinəsində Azərbaycana yardım məsələsi müzakirə olunmuşdu.

N.Şeyxzamanlı yazır ki, Tələt, Ənvər və Camal paşalardan başqa digər Osmanlı rəsmiləri türk ordusunun Qafqaza göndərilməsini müdafiə etmirdilər. Amma bir qədər sonra, türk ordusunun Qafqaza girməsinə ehtiyatla yanaşan və bunun Rusiya ilə yeni müharibə təhlükəsi törədəcəyindən çəkinənlərdən biri – Vehib paşa, müsəlmanlara qarşı erməni-bolşevik təcavüzü özünün son həddinə çatdığı zaman, mövqeyində dəyişiklik edərək, 1918-ci ilin aprel ayında bildirirdi ki, "mən hesab edirəm Bakını tutmaq və müsəlmanları xilas etmək üçün türk ordusunun göndərilməsi zəruridir".

Qeyd etdiyimiz kimi, N.Şeyxzamanlının Tələt paşa ilə görüşündən bir gün əvvəl Osmanlı hökumətində Azərbaycana yardım göstərilməsi məsələsi müzakirə olunmuş və nəticədə türk ordularının Qafqaza göndərilməsi qərara alınmışdı. Tələt paşa ilə görüşündən bir gün sonra Ənvər paşa tərəfindən qəbul edilən N.Şeyxzamanlı bu barədə yazır: "Paşa sonra mənə qərar qəbul etdiyini, Qafqaz İslam Ordusunun yaradılmasına başlanmasını və bir əlavə rütbə ilə zabit qeyd ediləcəyi üçün komissiya təşkil olunduğunu anlatdı".

---

[1] BOA, DH.ŞFR, no. 579/20, v. 1-11.
[2] BOA, DH.ŞFR, no. 579/20, v. 1-11; DH.ŞFR, no. 578/115, v. 1-3.

Qafqaz İslam Ordusu komandanlığına Ənvər paşanın ögey qardaşı yarbay Nuru bəy təyin edildi. Belə bir rütbə ilə bir neçə diviziyadan ibarət olacaq bir orduya komandanlıq etməsi Nuru bəylə ona tabe olacaq zabitlər arasında bir rütbə uyğunsuzluğu yarada bilərdi. Bu uyğunsuzluğu aradan qaldırmaq üçün ona Sultan Mehmed tərəfindən feriqlik (general-leytenant) rütbəsi və bütün Qafqaz İslam Ordusuna komandanlıq vəkaləti verildi. Padşah tərəfindən verilən fərmanla Nuru paşa həm də padşah yavəri elan edilmiş və Qafqazda ona padşahın siyasətinin təmsilçisi səlahiyyəti verilmişdi.

İstanbulda təşkil edilən komissiya tərəfindən Qafqaz İslam Ordusunun qərargahı üçün 20 nəfərədək zabit seçildi. Komissiya işini bitirən kimi Nuru paşa təyyarə ilə Mosula yola düşdü. Onun seçdiyi zabit heyəti isə quru yolla hərəkətə başladı və 1918-ci il mart ayının 25-də Mosula çatdı. Nuru paşa burada 6-cı ordu komandanlığından Qafqazdakı mövcud vəziyyətin öyrənilməsi üçün bölgəyə göndərilmiş zabit Müzəffər bəyin qayıtdığını eşitdi və onunla görüşdü. Azərbaycandakı vəziyyət haqqında Müzəffər bəydən xəbər tutan Nuru paşa səfərini sürətləndirməyə çalışdı. Ancaq Mosulda da o, bir sıra təşkilati işlərlə məşğul olmalı idi. Hər şeydən əvvəl isə Qafqaz İslam Ordusunun təşkili üçün zəruri olan kadrları seçməli idi. Bu məqsəd üçün Mosulda 6-cı ordudan 149 zabit və məmur, 488 gizir və əsgər seçildi. Bütün bu şəxslər 1918-ci il aprelin əvvəllərində Azərbaycana yola salındılar. Seçiləcək digər zabitlər və hərbçilər isə sonradan Azərbaycana yola salınmalı idilər.

1918-ci il aprelin 5-də Ənvər paşa Qafqaz İslam Ordusunun təşkili və vəzifələrinə aid Təlimatnaməni təsdiq etdi. Aprelin 8-də Nuru paşa Mosuldan yola düşdü. Nuru paşanın zabit heyəti çətin yol şəraiti ilə irəliləyərək Rəvandüzdən keçib aprelin 26-da Pesvaya, aprelin 29-da Savucbulağa və mayın 9-da Təbrizə çatdı, mayın 12-də Savucbulağ-Təbriz-Alacücə yolu ilə Təbrizdən hərəkət edərək həmin ayın 20-də Araz çayını keçdi və Şimali Azərbaycan ərazisinə daxil oldu. Mayın 24-də Yevlaxda Nuru paşanın böyük qarşılanma mərasimi oldu. 1918-ci il mayın 25-də Gəncəyə daxil olan Nuru paşanı erməni-bolşevik təhlükəsi ilə üz-üzə qalan Azərbaycan xalqı "göydən enmiş xilaskar bir mələk kimi" qarşıladı. Nuru paşa Gəncəyə gələn kimi Qafqaz İslam Ordusunun qarşısında dayanan vəzifələrin həlli üçün dərhal əməli fəaliyyətə başladı.

Onu da qeyd edək ki, Gəncə Müsəlman Milli Komitəsinin nümayəndəsi olaraq ölkəyə Osmanlı hərbi yardımını təmin etmək üçün İstanbula göndərilmiş N.Şeyxzamanlı 1918-ci il aprelin 10-da Ənvər paşanın təqdimatı üzrə Osmanlı hökuməti tərəfindən yüksək xidmətlərinə görə Məcidi nişanının üçüncü dərəcəsi ilə təltif olundu.[1]

## ARXİV SƏNƏDLƏRİNİN TRANSKRİPSİYASI

### № 30

[17 fevral 1918]
Devlet-i Osmâniye
Posta ve Telgraf ve Telefon Nezâreti
42

[1] BOA, İ.DUİT, no. 67/90, v. 1-2.

Târîh : 17/[0]2/[13]34
Mahrec : Samsun
Numara : 266
Dâhiliye Nezâreti'ne
Şifre
Mahremdir.

İki bin beşyüz yetmiş altı umûm doksan sekiz, husûsî numara dört: Kafkasya'nın Tiflis, Ardahan, Acara, Gence milletvekillerinden dört kişinin me'mûriyet-i mahsûsa ile İstanbul'a gitmek üzere Trabzon tarîkiyle fî 15 Şubat sene [1]334 târîhinde Samsun'a gelerek, Suşehri'ne hareket etdikleri Giresun Kâymakâmlığı'nın iş'ârı üzerine ma'rûzdur.

Fî 17 minhû
Canik Mutasarrıfı
Râşid
DH.ŞFR, no. 578/23.

***** ***** *****

**№ 31**

[19 fevral 1918]
Bâb-ı Âlî
Dâhiliye Nezâreti
Emniyet-i Umûmiye Müdîriyeti
Umûmî : 444
Husûsî:
Kalem-i Mahsûs
Şifre

Sivas, Ankara Vilâyetleriyle Kayseri, Kara-Hisâr-ı Sâhib ve Eskişehir Mutasarrıflıkları'na

Müst'aceldir.

Kafkasya'nın Tiflis, Ardahan, Acara ve Gence milletvekillerinden dört zâtın me'mûriyet-i mahsûsayla İstanbul'a gitmek üzere Giresun'dan Suşehri'ne hareket etdikleri Canik Mutasarrıflığı'nın iş'ârından anlaşılmışdır. Mûmâ-ileyhimin muvâsalat ve esnâ-yı seyâhatlerinde teshîlât ibrâzının îcâb edenlere serî'an teblîği.

Fî 19 Şubat sene [1]334
Nâzır
Mehmed Talat
Yazılmışdır.

DH.ŞFR, no. 84/100.

***** ***** *****

